# Eşq qibləsi Kərbəla

:Müəllif

Hacı İlqar İbrahimoğlu

:Çap nəşriyyat

İsfahan qaimiyyə adına kompüter araşdırma mərkəzi

:Digital nəşriyyat

İsfəhan Qaimiyyə adına komputer araşdırmalar mərkəzi

# Mündəricat

**Eşq qibləsi Kərbəla**

**Kitab Haqqında**

EŞQ QİBLƏSİ KƏRBƏLA

Hacı İlqar İbrahimoğlu

səh:١

## Ön söz

Dəyərli Oxucu! Sizlərə ilahiyyatçı-filosof Hacı İlqar İbrahimoğlunun xütbə və moizələri əsasında hazırlanmış daha bir yeni kitabı təqdim edirik. Əba Əbdillahın (ə), onun əhli-beytinin və o Həzrətlə (ə) şəhid olan qəhrəmanların yaratdığı eşq dastanını təsvir edən, Əhli-beytə (ə) xidmət etmək istəyən bir yaradıcı heyətin ərsəyə gətirdiyi bu .kitab, Məhərrəm-Səfər əyyamına həsr olunub

Eşq qibləsi – Kərbəla" kitabı – Aşura gününün çatdırışları, bu günün fəlsəfəsi,“ mahiyyəti, Kərbəla səhnəsində qəhrəmanlıq, vəfalılıq, eşq, bəndəlik dərslərinə həsr .olunub

Eşq qibləsi – Kərbəla" kitabı altı hissədən ibarətdir. Birinci hissə “Məhərrəm-Səfər“ əyyamının zirvəsi - Aşura" adlanır. Bu hissə Aşura günündə baş verənlər, onların .mahiyyəti, Əba Əbdillahın (ə) Aşura günündəki missiyasına həsr olunub

Bütün mənəvi xəstəliklərin müalicəsi Aşuradadır" adlı ikinci hissə əsasən Aşura“ əzadarlıqlarının fəlsəfəsi, bu əyyamın yaşadılmasının mənası, kamil insan yetişdirmə .proqramında Aşuranın rolundan bəhs edir

Üçüncü hissə - Kərbəlanın verdiyi tarixi və müasir dərslərə həsr olunub. Bu hissədə .xüsusilə Aşuranın baş vermə səbəbləri araşdırılır

Dördüncü və beşinci hissələr əsasən Aşuranın ikinci hissəsi – Aşuradan sonra Əhli-.beytin (ə) üzərinə düşən missiyadan xəbər verir

Sonuncu hissə isə Məhərrəm-Səfər əyyamının hüznlü yekunu – Rəsulallahın (s) rehləti, .İmam Rzanın şəhadəti və bu hüznlü günlərin mesajlarına həsr olunub

Dəyərli oxucu! “Eşq qibləsi – Kərbəla” kitabının cəmiyyətdə Məhərrəm-Səfər əyyamının fəlsəfəsinin daha da gözəl yaşadılmasında vasitəçi olacağına, bu eşq !karvanına qoşulmağımıza xüsusi şövq verəcəyinə ümid edirik

**Məhərrəm–Səfər əyyamının aşura zirvəsi**

?Məhərrəm ayına daxil olmuşuq. Bu ayın zirvəsi - Aşura günüdür. Nədir Aşura

Bu, bir əbədi, bir susmaz həyəcan təbilidir. Qiyamət gününədək insan vicdanına yönələn bir həyəcan təbili. Bu təbil insana onun yüksək və şərəfli bir vəzifəsini .xatırladır. AZAD İNSAN OLMAQ vəzifəsini

...Gerçəkdə Aşura bir tam, harmonik vəhdətdir

Burada Xeyir və Şərin əbədi vücudi qarşıdurması, bəzən Xeyirlə Şəri ayıran tük qədər nazik sərhəd tam surətdə təzahürünü tapmışdır. Bir sərhəd ki, yalnız ixlas, Allaha ...həqiqi bəndəlik sayəsində qorunur

...Kərbəla

Bir məkan ki, bəşər mövcudiyyatının ən alçaq və ən yüksək xislətləri burada ...kəsişmişlər. Və bu mübarizənin ən böyük qiyməti - Allah yolunda şəhadətdir

Bir tərəfdə cahillik, xəyanət, riyakarlıq, hərislik, qəlbi qaralıq, rəzalət - əlqərəz, insana xas olması mümkün olan və olmayan bütün mənfiliklər cəm olmuşdur. Digər tərəfdə isə məhəbbət, quruculuq, həqiqətpərəstlik, şücaət, mərdlik, şəfqət, şəxsiyyət və ləyaqət, yüksək əxlaq və mənəviyyat, həqiqi dəyərlərə sadiqlik, ruhun ən yüksək .pərvazını görürük

## Xeyirlə şərin qarşıdurmasının kulminasiyası

...Vəcdə gəlmiş sanki bütün varlıq aləmi bü gün

Aşura günündə, Kərbəla çölündə İmam Hüseyn (ə) və ٧٢ əziz silahdaşı İlahi Həqiqətin əsl daşıyıcıları kimi çıxış edirdilər. Lənətlik Yezidin ٣٠ minlik ordusu isə – məlun iblisin mənfur xidmətçiləri vəzifəsini üzərlərinə götürmüşdür. Və Aşura günü baş verən bu qeyri-bərabər döyüş, əslində Xeyirlə Şərin sadəcə növbəti toqquşması deyildi. Həqiqətdə burada ziddiyyətlərin qarşıdurmasının bir kulminasiyası, zirvə nöqtəsi sezilir. Qəsbkar, zülmkar, müstəbid lənətlik Yezid hər bir mənfilik və geriliyi özündə cəm edirsə, İmam Hüseyn (ə) bütün kamalların, Allah tərəfindən bəndə üçün müəyyən .edilmiş ən gözəl keyfiyyətlərin ən nəcib bir rəmzi kimi çıxış edir

Mədinədən Məkkəyə, oradan Kərbəlaya qədər uzanan bu ۶ aylıq eşq karvanının hər bir mərhələsində İmam Hüseyn (ə) bir əsas nöqtəni vurğulayır: zülm qəbuledilməzdir, ...İlahi dəyərlər ölməzdir

Qəsbkar lənətlik Yezid Mədinədəki valisi vasitəsilə İmam Hüseyndən (ə) beyət – hakimiyyəti tanımağı tələb etdikdə və əks təqdirdə ölümlə hədələdikdə, İmamın (ə) cavabı bir olur: «Mən heç zaman zilləti, alçaqlığı qəbul etmərəm! Yezidin hakimiyyətini .«!tanımaq – İslamın sonudur

İnsanlara öz mövqeyini çatdırmaq üçün Məkkəyə gedərkən, Mədinədə qalan qardaşı Məhəmməd Hənəfiyyəyə bir məktub qoyur İmam (ə). Bu, bütün nəsillərə ünvanlanmış bir İlahi vəsiyyətdir, insanlığın cövhəridir, yaşam fəlsəfəsidir. İmam Hüseyn (ə) buyurur ki, «Mən nə hakimiyyət, nə də var-dövlət üçün qiyam etmədim. Fəqət

insanları yaxşılıqlara dəvət etmək və pisliklərdən çəkindirmək, Allahın Elçisi Həzrət .«Muhəmmədin (s) pak və xalis dinini yaşatmaq üçün hərəkata başladım

.Nə qədər ibrət var bu hərəkatda! Qeyri-zorakı müqavimətin ölməz dərsi burada verilir

Və yol boyu İmam (ə) insanlara hərakatının qayəsini çatdırır: «Mən hakimiyyət üçün hərəkata başlamamışam. Mənim istəyim yalnız İlahi həqiqətləri ölməyə .«qoymamaqdır

Düşmən dəfələrlə beyət təklif edir. İstənilən qiyməti ödəməyə hazırdır bu beyət üçün lənətlik Yezid... Amma, İmam Hüseyn - babası Həzrət Mühəmmədin (s), valideynləri Həzrət Fatimə (s.ə) və Həzrət Əlinin (ə) tərbiyəsini, qardaşı İmam Həsənin (ə) son nəfəsədək fədakarlıq və həqiqətpərəstlik yolundan dönməyən və şəhadətlə ...sonuclanan həyat yolunu görən İmam Hüseyn (ə), məsləkindən dönə bilməz

**Şəhid oldular ki, insanlar xeyirlə şəri ayırsın**

Kərbəla səhnəsi... Nə qədər qəhrəmanlıqlar olubdur burada. Neçə-neçə salnamələr yazılmış burada... Necə insanlar qurban getdi ki, bəşəriyyət xeyrin nə, şərin nə .olduğunu bilsin

Əbülfəzl Abbas (ə)... İmam Hüseynin (ə) ələmdarı - bayraqdarı. Minlərlə yazılı və şifahi əsərlərin qəhrəmanı. «Babül-həvaic» - «Hacətlər qapısı»dır Həzrət Əbəlfəzl (ə). Bəs nə etmiş Həzrət Abbas (ə) ki, Allah Təala bu böyüklükdə məqamı bəxş etmiş ona? Bəs nə etmiş nurlu çöhrəsinə düşmənlərin baxmağa belə cürətləri çatmadığı bu misilsiz cəngavər? Hər an İlahi vəzifəsini yerinə yetirdi. Hər zaman İNSAN olaraq yüksəldi, Allah

bəndəsi olaraq yüksəldi... Qızmar səhrada susuz qalan körpələrə su gətirmək üçün düşmən cərgələrini yara-yara Fərata çatdı Həzrət Abbas. Amma sudan içmədi. İçə bilmədi. «Körpələr susuz olduğu halda, mən necə bu sudan içə bilərəm?!» deyərək, ciyəri qovrula-qovrula dolabı su ilə doldurub geri döndü. Düşmən ona yanaşmağa cürət etmədi. Uzaqdan ox atdı, nizə atdı. Yalnız «Əhli-beytin (ə) cəngavəri» qan itirməkdən zəiflədikdə, yezidin tör-töküntüləri ona yaxınlaşmağa ürək etdilər. Təslim olmaq təklifinə lənət və rədd eşitdi düşmən. Dolabı tutan mübarək qolunu kəsdilər Həzrət Abbasın (ə). O biri əli ilə götürdü dolabı - onu da kəsdilər. İmam Hüseynin (ə) bu əziz ələmdarını şəhid etdilər, amma təslim edə bilmədilər. Sonadək İlahi vəzifəsini yerinə yetirdi, yolundan dönmədi. Gerçəkdə qanı ilə əsrlərə yönəlik fədakarlıq ...(salnaməsini yazdı Həzrət Abbas (ə

## ...Peyğəmbərin (ə) əmmaməsi ilə getdi düşmən ordusuna qarşı

Həzrət Əli Əkbər (ə)... İlk olaraq düşmənin üzərinə gedən, ömrünün baharı Allah düşmənləri tərəfindən xəzanlığa çevrilən Əli Əkbər... Para-para olmuş vücudu əbasına qoyulub atasının yanına göndərilən Əli Əkbər (ə)... Həzrət Peyğəmbərə (ə) çox oxşayırdı nəticəsi Əli Əkbər... Peyğəmbərin (ə) əmmaməsi ilə getdi düşmən ordusuna qarşı ki, bəlkə ayılsınlar, tutduqları iblis yolundan dönsünlər. Amma heyhat! Susamışdı Peyğəmbər (s) övladlarının qanına düşmən... Şəhid etdi Əli Əkbəri (ə) düşmən... Övlad dağı vermək istədi İmam Hüseynə (ə)... Amma Allah bəndəsi nədi, imtahan nə?! Əli Əkbər kimi balasını itirən Hüseyn (ə) sarsıldımı, zəiflədimi? Əsla! Əsl ...məhəbbət kitabəsi yazılır burada

Həbib ibn Məzahir, Müslüm ibn Övsəcə və Kərbəlanın digər ağsaqqalları. Zəmanələrinin arifləri, elm və təqva təcəssümləri. Düşmənin təslim olmaq təklifinə hiddətlə reaksiya verən ağsaqqallar. Rəzil düşmən rəhm etmədi nə onların yaşına, nə də məqamına. Boyadı ağ saqqallarını qanlarına, amma döndərə bilmədi ...məsləklərindən

Hürr... Adı «azadlıq» mənasını verən sərkərdə. Öncə Yezid (lən) ordusunun minbaşısı idi bu Kərbəla qəhrəmanı. Həqiqət Günəşi onun üçün parlayan kimi, qəti qərarını verdi, keçdi İmam Hüseynin (ə) düşərgəsinə. Təsəvvür edək: ۳۰ minlik qoşunun komandirlərindən biri, həqiqətin nə olduğunu anlayan kimi seçimini edir – keçir bir ...ovuc azadxahın tərəfinə və qanına qəltan edilənədək bir an da olsun tərəddüd etmir

İmam Həsənin (ə) oğlu Qasim, Abdullah ibn Ümeyr və Kərbəlanın onlarla digər cavanları. Həyatlarının ən şirin çağlarını yaşayan, bütün ömürləri hələ irəlidə olan insanlar. Allah məhəbbəti gənc qəlblərini dolduran bir durumda onları üzük qaşı kimi əhatə edən düşmənin üzərinə getdilər və bir an da olsun seçimlərində tərəddüd etmədilər. Qorxunu, acizliyi, zülmə baş əyməni qəbul etmədi onların dəmir iradəsi... Sonadək İlahi vəzifələrində dönməz oldular və çöhrələrində təbəssümlə əbədiyyətə ...qovuşdular

**Heç kəsə rəhm edilmədi**

Onları şəhid etdilər... Heç kimə rəhm etmədilər... İmamın (ə) ۶ aylıq balası Əli Əsğərin də başını bədənindən ayırdılar, körpə uşaqlardan, müdafiəsiz xanımlardan ibarət əsir –karvanını – Peyğəmbərin (s) nəvə

nəticəsindən ibarət bu əsir karvanını şəhər-şəhər gəzdirib, olmazın məşəqqətlərə məruz qoydular...

Amma, hürlük və azadlıq bayrağını endirə bilmədilər! İmam Hüseyn (ə) və məsləkdaşları ləyaqət və izzət yolunda, İlahi dəyərləri yaşatmaq yolunda ən qiymətlilərini qurban verdilər, amma məsləklərindən dönmədilər. Onlar Kərbəla çölündə bir yenilməz fədakarlıq abidəsi ucaltdılar. Və İmamın «Şərəfli ölüm, zillətli həyatdan yaxşıdır!» çağırışı əsrlərdən bəri bütün azadxah insanları yüksək amallar yolunda fədakarlığa ruhlandıran bir mübarək dəvət olaraq qalır.

İlahi dəyərlərin, haqqın, ədalətin, doğruluğun, mərdliyin - hər bir kamalın ölməzliyini təmin edən bir dəvət...

Nə qədər nümunələr var burada! Düşmən sarsılmışdı bu qəhrəmanlıqdan! Bu yenilməzlik və qəhrəmanlıqlar sanki daha da azğınlaşdırmışdı düşməni. Çünki daha da güclü hiss edirdi, daha da çox duyurdu öz rəzilliyini, acizliyini, gücsüzlüyünü bu qurbanlar, fədakarlıqlar fonunda, bu eşq, bu məhəbbət fonunda zəlil olmuş düşmən...

Necə yazıldı bu qəhrəmanlıq eposu və kimlər yazdılar onu? Şəhidlər yazdı, sonra əsirlər yazdı bu məktəbin şanlı səhifələrini.

### Azadəlik mayakı

Həzrət Zeynəb (s.ə)... Kərbəla müsibətini dünyaya aşkar edən, zalım saraylarını sarsıdan Zeynəb (s.ə)! Lənətliklərin acıq vermək, şəmatət etmək cəhdlərinə «Mən (Kərbəlada) gözəllikdən başqa bir şey görmədim» - deyən Zeynəb... Yezid lənətliyi susduran, onu öz səh:٧

əlaltılarının yanında rüsvay edən Zeynəb (s.ə)! İlahi məhəbbətinin gücü, əzmi, fədakarlığı, nəcabəti, izzəti ilə yezidləri xar edən, aşağılayan Zeynəb (s.ə)... O dərəcədə xanım Zeynəb (s.ə) rəzil etdi Yezid lənətliyi ki, əvvəldə «yaxşı aldım ata-babamının qisasını Peyğəmbərdən» deyən bu məlun, sonda «mən bunu istəmirdim, xəbərim olmayıb» kimi qorxaq mövqeyə də əl atmağa cəhd etdi, özünü təmizə çıxarmağa səy etdi. Və çox çəkmədi ki, etdiyi cinayətlərin hələ bu dünyadaca əvəzini ...almağa başladı

Bəs kiçik balalar! Allah, Allah! Onların gözü qarşısına gətirirdi kəsilmiş başları Allah !düşmənləri ki, itkinin acısını artırsın... Bəşər görməyib belə zülmü

!?Amma nə edə bildi düşmən

...Zərrədək təslim etdirə bilmədi bu kiçik balaları belə

!?Kimdir bu cəhənnəm əhlini xatırlayan

Kimdir bu lənətlik yezidlərin, şümrlərin, ömər sədlərin, ibn ziyadların, hərmələlərin, !?özünə əbədi atəşi vacib etmiş minlərlə digər bəşəri canilərin adını lənətsiz çəkən

Amma Ruqəyyələri, Səkinələri, onlarla digər qəhrəman balaları hamı necə məhəbbətlə ...yad edir, onları öz İlahi məhəbbətinə vəsilə qərar verir

Dövr edəcək çərxi-fələk, dəyişəcək dünyanın gərdişi. Amma hicrətin ۶۱-ci ilində susuz səhrada yazılmış bu müqqədəs vücüdi əsər heç zaman unudulmayacaq... Allaha məhəbbətdən, insana məhəbbətdən, bəşəriyyətə məhəbbətdən, kamal adına nə varsa, ona məhəbbətdən yoğrulan bir ixlaslı salnəmə hər zaman dünyanın hər bir yerində yaşayan azadxah insanlar üçün sönməz bir hürrlük rəmzi, azadlıq mayakı, ...azadəlik mayakı olacaqdır

## Aşura – qanın qılınca qalib gəldiyi gündür

Aşuraya aid hadisələrə diqqət etdikdə, görürük ki, bir qisim hadisələr Aşura gününədək baş verənlərdir, bir qisim bilavasitə Aşura gününün hadisələridir, digər hissəsi isə Aşuradan sonrakı dövrə aiddir.

Aşura günündən əvvəlki period – İmam Hüseyn (ə) Mədinədən çıxmağa hazırlaşandan, Mədinədən çıxıb Məkkəyə gələndən, Məkkədən çıxıb Kufəyə doğru hərəkət edəndən, gəlib Kərbəlaya çatanadək, burada dayanacaq quranadək olan bir zaman kəsimidir. Eyni zamanda, bu period İmamın (ə) ümumi mesajlar göndərməsi ilə səciyyəlidir. Hər an Yezid lənətliyin istibdadından və ümmətə, İlahi dəyərlərə olan təhlükədən insanları agah edir. Kərbəla səhnəsində də, ilk gündən Aşura gününədək insanlara həqiqətlər çatdırır. Hər nə lazımdırsa, edir ki, insanların seçimləri iradəvi olsun. Bütün vasitələrlə İmam Hüseyn (ə) bir işlər görür ki, insanların seçimi şüurlu olsun. Sonra heç kəs deməsin ki, "mən anlamadım nə baş verirdi". Eyni zamanda, İmam (ə) onunla qayğılanırdı ki, yanındakı insanlar etdiklərinin nə üçünlüyünü, niyəliyini dərk etsinlər, əhəmiyyətini anlasınlar. Seçimlərini şüurlu etsinlər, İmamın (ə) yanında şüurlu olaraq qalsınlar, niyə qaldıqlarını bilsinlər, özləri üçün bunu müəyyən etsinlər. Kor-koranəlik olmasın, vərdiş olmasın, növbətçi xarakter daşımasın.

## Kərbəla vaqiəsinin müqəddiməsi

Hicrətin ۶۰-cı ilində rəcəb ayının ۱۵-də dövrün və ümumiliklə İslam tarixinin ən böyük zalımlarından olan lənətlik Müaviyyə ölür və onun nadanlıq və əxlaqsızlıqda ad çıxarmış oğlu lənətlik Yezid xilafəti qəsb edərək, atasının yerində oturur. Ölümündən bir az əvvəl Müaviyyə Yezidin hakimiyyətə gəlişini təmin etmək üçün ümmətin sözükeçən insanlarından öncədən beyət – tanıma almağa çalışırdı. Bir neçə nəfər bu mövzuda prinsipiallıq göstərdi ki, bunların arasında ümmətin İmamı, müsəlmanların rəhbəri Həzrət Hüseyn (ə) öncüllük təşkil edirdi. İmam Hüseynin (ə) beyət etmədyini nəzərə alan ağılsız və inadkar Yezid (lən), Mədinə valisinə İmamdan (ə) bu beyəti almağa nail olmaq tələbi ilə bağlı bir məktub göndərir. Rəcəb ayının ۲۸-də həmin məktub Mədinənin valisinə çatır. Məktubda Yezid lənətlik validən tələb edir ki, İmam .Hüseyn (ə) onun hakimiyyətini tanımayacağı təqdirdə, o Həzrəti (ə) qətlə yetirsin

Tarixlərə diqqət yetirək. Hicrətin ۶۰-cı ili. Həzrət Peyğəmbərin (s) dünyasını dəyişməsindən çox az bir müddət – cəmi ۴۹ il keçir. Ümumən İslamın gəlişindən də tarix baxımından az bir müddət keçir – ۷۰ ilə yaxın. Amma proseslərə bax ki, Peyğəmbər dininin daşıyıcısından, ümmətin İmamından (ə) tələb edilir ki, bu dinin əsaslarını sarsıdan, ümmətin idarəolunmasını qəsb edən bir zalıma beyət etsin, onun hakimiyyətini tanısın! Ümmətin süstlüyü, Peyğəmbər (s) prinsiplərindən çəkilməsi bu ...qədər böyük əyintilərə və sarsıntılara gətirib çıxardı

Belələiklə, lənətlik Yezidin beyət tələbi ilə bağlı məktubunu alan vali, ertəsi gün - rəcəb ayının ٢٩-da İmam Hüseynin (ə) yanına gələrək, bu tələbi Həzrətə (ə) çatdırır. İmam Hüseyn (ə) valiyə rədd cavabı verir və ölüm təhdidi qarşısında da geri çəkilməyəcəyini bəyan edir. Artıq bir vəziyyət yaranıb ki, Əba Əbdillah (ə) Mədinədə qala bilmir. O Mədinə ki, ٦٠ il öncə Peyğəmbərin (s) buraya hicrəti ilə nurlanmışdı, o Mədinə ki, buradan İslamın bütün Ərəbistana yayılması baş vermişdir, ٦٠ il sonra Peyğəmbər (ə) yadigarını müdafiə etmək iqtidarını itirib. Əba Əbdillahın (ə) mövcudiyyətini təmin edə ...bilmir Mədinə

Yezid lənətliyin İslama olan böyük təhlükəsini nəzərə alan və müsəlmanları bu təhlükədən xəbərdar etmək missiyasını daşıyan İmam Hüseyn (ə), Mədinəni tərk .etmək qərarına gəlir

### Mədinədən başlayan azadlıq yürüşü

Həmin gün - hicri ٦٠-cı il rəcəb ayının ٢٩-da İmam Hüseyn (ə) Mədinədə Həzrət Peyğəmbərin (s) mütəhhər məzarını ziyarət edərək, babası ilə vidalaşır. Son ziyarətini edən İmam (ə), öz məram və niyyətlərini izah edən vəsiyyətini qoyur. Vəsiyyətində İmam Hüseyn (ə) bəşəriyyətə izah edir ki, hərəkata başlayır və hərəkatının məramı mənsəb və məqam deyil, fəqət Allah dinini yaşatmaq, yaxşılıqlara dəvət ebib, .pislikərdən çəkindirməkdir

Vəsiyyəti yazdıqdan sonra, İmam Hüseyn (ə) ümməti Yezid lənətliyin istibdadının və hakimiyyət qəsbinin

təhlükələri barədə agah etmək üçün Məkkəyə doğru hərəkət edir. Öz yaxınları və məsləkdaşları ilə birlikdə Mədinədən Məkkəyə doğru hərəkət edən İmam Hüseyn (ə), .hər an ölüm təhlükəsi qarşısında olur

Şəban ayının ۳-də - təqribən ۴ gün sonra İmam Hüseyn (ə) öz əhli-beytilə Məkkəyə daxil olur. Burada İmam (ə) camaatla görüşür və onlara yaranmış vəziyyəti çatdırır. Təqribən ۱ ay bu proses davam edir və İmam Hüseyn (ə) Məkkədə - İslam dininin ən müqəddəs məkanında öz İlahi missiyasını yerinə yetirərək, müsəlmanları mövcud .durumdan və baş verə biləcək təhlükələrdən agah edir

Hicri ۶۰-cı il ramazan ayının ۱۰-da İraqın Kufə şəhərindən olan ۲ nəfər nümayəndə kufəlilərin məktubunu İmama (ə) çatdırır. Məktubda kufəlilər elan edirlər ki, Yezid .lənətliyin qəsbini qəbul etmirlər və bu barədə İmamı (ə) məlumatlandırırlar

Ramazan ayının ۱۵-də artıq minlərlə - əksər tarixi mənbələrə görə ۴۸ min - məktub gəlir İmama (ə) Kufə əhlindən. Məktublarda kufəlilər İmama (ə) beyət etdiklərini, .Yezid lənətliyin hakimiyyətini tanımadıqlarını bəyan edirlər

İmam Hüseyn (ə) vəziyyəti öyrənmək üçün öz nümayəndəsi Müslüm ibn Əqili Kufəyə .göndərir

**İmamın (ə) elçisi**

Müslüm ibn Əqil təqribən ۲۰ gün sonra - şəvval ayının ۵-də Kufəyə daxil olur. Burada camaat kütləvi surətdə İmam Hüseynin (ə) nümayəndəsi olaraq ona beyət edir. Bu, özlüyündə böyük bir proses idi, bu prosesin nəhəng bir tarixi

müqəddiməsi var idi və bu barədə ayrıca çoxlu danışmaq olar. Lakin, biz bu gün sadəcə hadisələrin xronoloji ardıcıllığını izləmək istəyirik. Beləliklə, Yezidin (lən) hakimiyyəti qəsb etməsindən ٢ ay ٢٠ gün sonra İmamın (ə) elçisi artıq Kufədə .camatdan beyət qəbul edirdi

Kufədə gedən proseslərin nəticəsi olaraq, buraya gəlişindən ١ aydan bir az keçmiş - ziqədənin ١١-də Müslüm ibni Əqil Kufəyə dəvət etmək məzmununda İmam Hüseynə .(ə) məktub yazır

Zilhiccənin ٨-də İmam Hüseyn (ə) Məkkədən çıxır. Bu ərəfədə İmama (ə) xəbər çatır ki, Yezid (lən) onu gizli surətdə qətlə yetirmək üçün xüsusi qatilləri Şamdan Məkkəyə göndərmişdir. Burada lənətlik Yezid bir neçə niyyət güdürdü. Əgər o, İmamı (ə) aşkar qətlə yetirsəydi, müsəlmanların böyük hiddətini qazanacaq və hakimiyyətinə təhlükə yaradacaqdı. Gizli qətlə yetirməklə isə insanların baş verə biləcək narazılıqlarını qarşılamaq və İmamın (ə) qanını batırmaq imkanı əldə edirdi; qətlin gizli olması səbəbindən Yezidin bu qətldə əlinin olması çətin sübut oluna bilərdi. Eyni zamanda, İslamın düşməni olan Yezid, Kəbə evində Peyğəmbər (ə) nəvəsinin qanını tökməklə Məkkə kimi əzəmətli və əmin yerin ehtiramını aşağılamaq istəyirdi. Bunları nəzərə alan .İmam Hüseyn (ə), Məkkəni tərk edib Kufəyə doğru irəliləmək qərarını verir

Yol boyu ona qoşulmaq istəyən minlərlə insana İmam Hüseyn (ə) çatdırır ki, bu hakimiyyət üçün, məqam və mənsəb ardınca olan bir səfər deyil, yalnız Allah dinini yaşatmaq, yaxşılıqlara dəvət edib, pisliklərdən çəkindirmək niyyəti güdən bir hərəkatdır. Və İmam (ə) onu da bildirir ki, bu hərəkat, şəhadət şərbətini içməklə ,sonuclanacaq. Beləliklə, İmamın (ə) yanında yalnız canını Allah yolunda

Peyğəmbər (s) dəyərlərinin yaşaması yolunda qurban verməyə hazır olan ۱۰۰-dək ...adam qalır

## Həyatı xilas etmək təklifi

Həmin gün - zilhiccənin ۸-də Müslüm ibn Əqilin ətrafında olan ۴ min kufəli Yezidin valisi olan Übeydulla ibn Ziyadın hədələri qarşısında geri çəkilir və İmamın (ə) elçisini tək ...qoyurlar. Ertəsi gün, zilhiccənin ۹-da tənha qalmış cənab Müslüm şəhid edilir

Kufəlilərin xəyanəti və Müslümün şəhadəti xəbəri İmama (ə) yolda olanda çatdırılır. İmam (ə) yolunu dəyişmir və vücudi missiyasını yerinə yetirərək, irəliyə hərəkətini .davam etdirir

Məhərrəm ayının başlaması ilə hicrətin ۶۱-cı ili yetişir. Məhərrəm ayının ۲-də, Məkkədən çıxdıqdan təqribən ۲۴ gün sonra İmam Hüseyn (ə) öz əhli-beyti və məsləkdaşları ilə Kərbəlaya daxil olur. Burada İmam (ə) düşərgə salır. Yezidin ۳۰ minlik ordusu İmamı (ə) mühasirəyə götürür. Qoşunun başçısı Ömər ibn Səd dəfələrlə İmama (ə) yezid hakimiyyətini qəbul etmək, lənətlik Yezidə beyət edərək həyatını xilas etmək təklifini verir. Lakin, İmam Hüseyn (ə) Yezid hakimiyyətini qəbul etməyin İslamın din olaraq məhv olmasına gətirib çıxaracağını bəyan edərək, beyətdən imtina ...(edir. «Heyhat minnəz-zilləh!» - «Zillət bizdən uzaqdır!» deyir İmam (ə

Mühasirə daha da azğınlaşır, İmamın (ə) düşərgəsini sudan məhrum edirlər. İmam .Hüseyn (ə) və məsləkdaşları bütün məhrumiyyətlərə baxmayaraq, təslim olmayırlar

Azğınlaşmış düşmən ümmətin İmamının (ə) qanına susayır... Hicri ۶۱-ci ilin məhərrəm ayının ۱۰-da Kərbəla səhrasında İmam Hüseyn (ə) və ۷۲ məsləkdaşı öz mübarək şəhid ...qanları ilə ölməz bir qəhrəmanlıq salnaməsi yazırlar

səh:۱۴

İmam Hüseyn (ə) bütün mümkün olan vasitələrlə düşmən tərəfə də ayıldıcı mesajlar verirdi. Xəbərlər göndərirdi ki, onlar səhv yolda olduqlarını, özlərini hansı həlakətə düçar etdiklərini, aqibətlərinin zəlillik olmasını anlasınlar. Ümmətin İmamı (ə) bir xüsusi məhəbbətlə ümməti ayıltmağa çalışırdı. Diqqət edək: burada söz işləyir, məntiq işləyir. Bunlar düşüncəyə yönəlik məsələlərdir, ağıla, rasionalizmə yönəlik məsələlərdir. Bunların bazisində ayıldıcılıq yükü durur, bunlar insanın təfəkkür qabiliyyətini hədəfləyir. İnsanların yadına salınır, onlara məlum olan mətləblər xatırladılır, onlardan bircə-bircə soruşulur və s. Hədəf də odur ki, insanlar dərklə bu mövzulara diqqət .etsinlər

**Əsri–Aşurayədək olan dövran**

Aşura günü isə söz müstəvisindən əməl müstəvisinə keçid edilir. İmamın (ə) buyurduğu sözləri hər kəs əməli formada, praktik formada həyata keçirir. Bir Aşura qəhrəmanlıq və izzətlilik məktəbinin əsası qoyulur burada. Bu mərhələ o vaxta qədər davam edir ki, Aşuranın əsr vaxtı yetişir, Əba Əbdillah (ə) öz Rəbbinə qovuşur. Bir bəşəri faciə yaşanır burada. Amma, eyni zamanda, əsrlərə yönəlik bir dönməzlik və şücaət abidəsi qoyulur burada. Haqqın nahaqqa qarşı duruşu var burada. Və bu duruşun bütün qeyri-bərabərliyinə baxmayaraq, Haqq təmsilçisinin zahirdə həlak edilməsinə, üzərindən atların çapılmasına, hər cür vəhşiliklərə məruz qalmasına baxmayaraq, nahaqq üzərində sarsıdıcı və birmənalı qələbə çalması var burada. Kəmiyyətin böyük əhəmiyyət daşımamasına, həlledici amil olmamasına sübut var burada. Sayı ١٠٠-dən çox olmayan, amma ٣٠ minlik azğın qoşunun qarşısında öz qanları ilə yenilməzlik, sədaqət, əhdə vəfa, şəfqət, fədakarlıq, qeyrət salnaməsi yazan .İNSANların qəhrəmanlıq eposu var burada

Sonadək əyilməyən, ağlagəlməz imtahanlardan ən şərəfli durumda çıxan sadə ...insanların bir İlahi əhvalatı var burada

Nə qədər nümunələr var Aşurada! Düşmən sarsılmışdı bu qəhrəmanlıqdan! Bu yenilməzlik və qəhrəmanlıqlar sanki daha da azğınlaşdırmışdı düşməni. Çünki daha da güclü hiss edirdi, daha da çox duyurdu öz rəzilliyini, acizliyini, gücsüzlüyünü bu ...qurbanlar, fədakarlıqlar fonunda, bu eşq, bu məhəbbət fonunda zəlil olmuş düşmən

**Bütün mənəvi xəstəliklərin müalicəsi Kərbəladır**

Aşuranı yaşatmaq istəyər, Aşura ilə ruhiyyəsini həmahəng etmək istəyər, Hüseyn (ə) ...eşqinə məclislər qurular

**?Nədən dəyişir insanların haləti**

İnsanların, toplumun içindən gələn bir haldır bu. Ağlagəlməyən, gözlənilməyən qapılarda, evlərdə, müxtəlif məkanlarda İmam Hüseyn (ə) məclisləri qurular. Bizim dəyərli xalqımız, əziz xalqımız bu ruhiyyəni minbir əziyyətlərlə əldə edib və əldən də verməyəcək. Bu, Allahın bu topluma bir lütfüdür, inayətidir. ۷۰ illik Sovet yönətimi də bir il yox, beş il yox, on il yox - yetmiş ilə qədər bu ruhiyyəni sıxışdırdı, amma insanların qəlbindən bu ruhiyyəni yığışdıra bilmədi. Zaman-zaman bəzi nihilist klassiklər meydana çıxdı, xalqın içindən gələn bu nurani İmam Hüseyn (ə) anma məclislərini, Kərbəla məktəbini

yaşatma məclislərini, əzadarlıqlarını tənqid etmək istədilər, cürbəcür sözlər istədilər qoşsunlar, guya ki, onların "oxumuş" durumları xalqın içindən gələn bu səmimi eşqi anlaya bilməmişdi. Beləlləri mahiyyət etibarilə, əvvəllər Çar imperiyasının, bu gün də bir başqa qalıqların, tör-töküntülərin sifarişlərini yerinə yetirirlər. Beləlləri Çar imperiyasında "ziyalı" siması ilə xalqın ənənələrini, duyğularını, ruhiyyəsini aşağılayıblar. Bu hal günümüzdə də davam edir. Amma heç bir təsiri yoxdur. Əksinə, qürurverici bir hal var: bu toplumun Hüseyn (ə) məclisləri, Hüseyn (ə) əzadarlıqları olan yerlərində cavanlaşma gedir. Yaş həddi daha da aşağı enir. Gənclər, yeniyetmələr Hüseyn (ə) məktəbinin şagirdliyinə yazılır. Təşəkkür düşür o ağsaqqalara, o pak ətəkli ağbirçəklərə ki, onların duaları ilə, bərəkəti ilə bu ab-hava, bu ruhiyyə günümüzə də gəlib çıxıb. Bu ruhiyyənin gözəl bir xüsusiyətti var: nə qədər sıxacaqlar, bir o qəfər bu məclislər keyfiyyətcə də, kəmiyyətcə də daha da nuraniləşəcək və şükürlər olsun ki, .nuraniləşməkdədir də

**Hər kəsin bu ruhu yaşatmaq missiyası var**

Hər kəsin bu məktəbdə olan bu nuru yaşatma missiyası var. Bu əyyam təkcə Tasua ilə, Aşura ilə, İmamın ٣-ü, ٧-si ilə və s. simvolik rəqəmlərlə bitmir. Bu əyyamın hamısını yaşatmaq lazımdır, evlərimizdə, küçərəlimizdə, dostlarımızla, yaxınlarımızla, ailələrimizlə fürsətlər tapıb, yaşatmaq lazımdır. Həmd olsun Allaha ki, bu əyyam yaşanır, ildən-ilə daha da çox yaşanar, inşəallah. Bu, hansısa maddi təfəkkürlə hesablamaların, təhlillərin anlaya bilcəyi bir məsələ deyil. Sırf maddi amillər nəzərə alınsaydı, gərək "Lə iləhə illəllah" nidasını gətirən və bu nidaya görə min cür müsibətlərə, əziyyətlərə dözən ١٢۴٠٠٠ peyğəmbərin (ə) bu nidasından ümumiyyətlə bəşərdə, dünyada bir əsər-əlamət

qalmamaydı. Amma əksinə bir hal baş verir. Çünki burada Allahın lütfü var, qeybi köməklikləri var. İnsanların pak fitrətləri var, içlərindən gələn səmimi duyğuları var. Ən daşlaşmış qəlblər, qəsavət bağlamış qəlblər Hüseyn (ə) məclisində bir titrəyişə gəlir, tövbə halına gəlir, peşmançılıq əldə edir, özünəqayıdışa nail olur. Bu məktəbin bu .nuraniyyəti, bu incəliyi hər kəsə bəllidir

## Aşura – mərəzlərin müalicəsidir

Bu mərasimlərin, bu məclislərin çoxlu faydaları var. Bunlardan ən mühümü budur ki, biz ibrət götürürük. Bu məktəbdən, bu nuraniyyətdən ibrətlər götürürük. Çünki bu məktəbdə çoxlu ibrət götürməli, öyrənilməli nüanslar var. Çoxlu bəhrə aparılmalı məsələlər var. Aşura məktəbi ibrətlərlə doludur. Ən böyük ibrətləridən biri də budur ki, Aşura məktəbi bizə içimizdəki mərəzlərə, xəstəliklərə, naqisliklərə, eybəcərliklərə qarşı ayıq-sayıq olmağı öyrədir. İçimizdəki viruslara qarşı diqqətli olmağı öyrədir. İnsanın cisminin müəyyən xəstəlikləri, mərəzləri var və bu mərəzlər, mikroblar münasib bir məqam gözləyərlər ki, üzə çıxsınlar. Həmin mərəzlər fürsət axtarırlar, bəzən adam gözləmədən onlar üzə çıxır. Bədəndə olan bu mərəzlər üzə çıxanda bizdən icazə almadığı kimi, istədikləri vaxt hərəkətə keçdikləri kimi, bizim mövcudiyyətimizin əsas hissəsi olan ruhumuzda da bu cür mərəzlər, mikroblar mövcuddur. Həmin mikroblar da münasib vaxt gözləyirlər. Bu mikrobların tarix boyu .ümmətə vurduqları zərbələr göz önündədir

Necə olur ki, Həzrət Peyğəmbərin (s) dövründəki bir toplum müsəlmandır, iman (gətirib, mömindir, amma Kərbəlada belə bir müsibət törədir?! Peyğəmbər (s

zamanından cəmi ٥٠ il keçməsinə rəğmən, həmin toplumun üzvlərinin öz daxilindəki xəstəlikləri, mikrobları müalicə etmədiyinə görə, bir gün şəxsiyyətlərinin bu səviyyəyə .qədər deqradasiyası, tənəzzülü baş verə bilir

**Mənəviyyat karvanının qarşısını heç bir qüvvə ala bilməz**

Əsrlərdir ki, matəm, əza ayı olan mahi-Məhərrəm yetişəndən Hüseyn (ə) aşiqi, Hüseyn (ə) sevən insanların yaşadığı dünyanın hər bir nöqtəsində əzadarlıqlar keçirilər. Hansı coğrafiyada, hansı yerdə, hansı məkanda olmasından asılı olmayaraq, Hüseynsevərlər bu böyük matəmi yaşadarlar. Bəzən insanları sıxarlar və nəticədə zahirdə bu əzadarlıqların keçirilməsi görsənməz. İllər keçər və ilkin fürsət yarananda bu məktəbi, bu nuru, bu işığı, bu mənəviyyat karvanını aradan aparmaq istəyənlərin arzularının .puça çıxdığı məlum olar

Bir neçə tarixi məqama toxunmaqla, bu tezisin nə qədər dəqiq olduğunu görmək olar. Belə tarixlərdən birini də elə xalqımız yaşayıb. Çar dövründə hədəf qoyulur ki, Aşuranın mahiyyəti unudulsun, Aşuranın o zahiri çalarları saxlansın ki, nəhayətdə xalqın oxumuş hissəsi ilə xalqın özü arasında fərqlilik, fikir ayrılığı meydana çıxsın. Çar imperiyası bu missiyanı yerinə yetirmək üçün bəzi nanəcibləri də yetişdir. Çar "uşkolları"nın yetirmələri olan bu ünsürlər imperiyadan yediyi pulların hesabını öz işləri ilə ödəməli idi. Onlar xalqının, toplumunun, millətinin ənənələrini, dinini, milli kimliyini sual altına qoymağı missiya olaraq üzərilərinə götürür. Bu danışdığımız hansısa uzaq bir diyarın deyil, öz xalqımızın tarixidir. Sonradan Sovet dövrü, qırmızı ideologiya, bolşevik təfəkkürü gəlir və oxşar ənənəni davam etdirir. Çar dövründə yetişmiş həmin səh:١٩

uşkollar"ın məzunları onların da dərdlərinə yarayır. Onlar xalqın kimliyini, dinini, adət-" ənənəsini aradan aparmaq hədəfində eynidirlər. Bu məsələdə iki dövr arasında bir müttəfiqlik meydana gəlir. Çar imperiyası da bir yeri işğal edir və bu yerdə insanların milli kimliyini məhv edib özlərinə tabe etdirmək üçün insanlara ləyaqət verə biləcək hər bir şeyi sıradan çıxarmağa çalışırdı, Sovet dönəmi də oxşar siyasəti həyata keçirir. .Hər iki dövrdə o zamanın yerli insanlarından istifadə olunur

## Xalqımız tarixi müsibətlərində Kərbəla məktəbinə qayıdıb

Sovet bəlası qurtarandan sonra belə sadəlöhv düşüncə meydana çıxmışdı ki, artıq hər bir şey qurtarıb və artıq Çar dövrünün və Sovetin bəlaları yaşanmayacaq. Lakin, indi iki dövrün zümrəsi ilə bərabər, üçüncü zümrə də əmələ gəlir. Bu üçüncü zümrə də müasir dönəmin İslam düşmənçiliyi, islamofob düşüncə ilə qidalanmış təbəqənin yetirmələridir. Onlar da bu gün özlərinə vəzifə bilirlər ki, bu mərhələdə Çar dövründə çara xidmət edən "uşkol" məhsulu olan "ziyalılar"ın, Sovetə xidmət edən qırmızı vəsiqəli "ziyalılar"ın gördüyü işləri indi onlar davam etdirsinlər. İndi belə bir zümrə meydana çıxır. Bu zümrənin Aşura məktəbinə qarşı təhtəlşüur səviyyəsində güclü qarşıdurması var. Bu zümrənin manqurt mahiyyəti Aşurada olan dəyərlərə .antaqonistdir. Bu motivlər ucbatından, bacardıqlarını edirlər ki, Aşuranı unutdursunlar

Amma, bütün bunların nəticələri necə olur? Nəticə bu cür olur ki, çar dövrünü, Sovet dönəmini yaşamış bir xalq, ondan sonrakı mərhələdə davam edən bütün çətinliklərə

rəğmən, Aşura məktəbini daha təmtəraqla yaşadır. Bir halda ki, televizor buna qarşı danışır, radio buna qarşı danışır, ictimai rəy buna qarşı qaldırılır, oxumuş təbəqəni bir formada buna qarşı danışdırırlar, ildən-ilə xalq bu Kərbəla məktəbini daha böyük eşqlə, daha böyük sevgi ilə, daha keyfiyyətlə yaşadır. Artıq indiki dövrdə Kərbəlanın bütün çalarları da meydana çıxarılır. Həm maarif yükü artıb, həm eşqin cuşa gəlməsi artıb, həm keyfiyyət, həm də kəmiyyət artıb. Tarixən də bütün ağır şəraitlərdə, ekstremal şəraitlərdə xalq bu vəziyyətlərdə həmin tarixi yaddaşına qayıdıb. Alt yapıdan insanlar bu məktəbə müraciət edib. ٢٠ yanvar hadisəsi hər bir kəsin yadındadır ki, cinayətin baş verməsinin səhəri günü insanlar Sovet qoşununun qarşısına matəmlə çıxarkən, şəhidlər üçün hüzn bu məktəbin ənənələrinə uyğun .yaşadılıb

**İnsanların qəlbində sönməz Kərbəla ocağı var**

İldən-ilə Aşura məktəbinin yaşadılması ilə bağlı həm kəmiyyət, həm də keyfiyyət artır. Bu artım yalnız bizim məmləkətimizdə müşahidə edilmir. On beş, iyirmi il öncə İraqda Kərbəla ziyarətinə gedənlər bunu çox yaxşı bilirlər. Çox az sayda insan böyük çətinliklər, təzyiqlərlə ziyarətə gedirdi. O qədər çətinlik, o qədər repressiya, o qədər sıxışdırılma var idi ki, insanlar beş-on nəfərdən çox ziyarətgaha buraxılmırdı. Onilliklərlə Səddam kimi diktatorlar öz missiyalarını həyata keçirir və zəlil halda aradan gedirlər. Bundan sonra cəmi bir neçə ay bəs edir ki, növbəti Məhərrəm-Səfər və Aşurasında bütün dünyanın gözü oraya yönəlir. Zəvvarların sayı milyonlara çatır. Dünyanın bütün yerlərində eyni proses müşahidə olunur. Harada ki, Aşuraya qarşı nəsə işlər görüləcək, müvəqqəti səh:٢١

olaraq, zahirdə aradan getmiş kimi görsənə bilər, lakin insanların qəlbində bu, heç bir .zaman itməyəcək

Bu, necə baş verir? Bu, nə məsələdir ki, xalq aşağıdan yuxarı, elliklə bu məktəbi yaşadır? Kişilər, xanımlar, yaşlılar, cavanlar – bütün dərk edən təbəqələr bu məktəbi yaşadır. Bəzi şeylər olur ki, o yaşlı üçün aktual olur, bir məsələ olur ki, cavanlar üçün aktual olur və s. Lakin, Aşura elə bir məktəbdir ki, yaşından, sosial durumundan, imkanlarından asılı olmayaraq, hər bir insan üçün aktualdır. Burada məsələ çox köklüdür. Belə ki, insanların qəlbində bu məsələ var və imanlarının nəticəsidir. Ötən bəhslərimizdə bu mövzuya işarə etdik. Həzrət Peyğəmbər (s) dəfələrlə bildirir ki, iman sahiblərinin qəlbində İmam Hüseynin (ə) şəhadəti ilə bağlı xüsusi bir hərarət var və o ...insanı hərəkətə gətirər. Qiyamətə qədər həmin hərarət sönməz və soyumaz

**...Əgər İmam Hüseyn (ə) olmasaydı**

İkinci önəmli məsələ isə budur ki, dinin mövcudluğu bu məsələlərə bağlıdır. İnsan gerçək inanclılıq yaşatmaq istəyirsə, o, fərqində olur ki, İmam Hüseyn (ə) olmasaydı, İslam adına yalnız dekarasiya qalmış olardı. İmam Hüseyn (ə) olmasaydı, İslamın cövhərindən heç bir şey qalmazdı. Bir Ramazan ayında bu məsələ var ki, Ramazan ayında oruc tutanın nəfəsi zikrdir. Oruc tutanın bütün işləri ibadətdir. Oruc tutanın vəziyyəti elədir ki, hətta yatsa da, yenə ibadət halındadır. Eyni məsələ Məsum İmamlardan (ə) məhərrəm ayı ilə bağlı da göstərilib. Əhli-beyt (ə) bildirir ki, məhərrəm ayının əzadarları üçün də bu durum, bu mənəvi yüksəliş var. Oruc tutan yemək yemir, su içmir, orucu pozan digər işləri görmür, əzadar isə isə iradəvi olaraq İmam Hüseyn (ə) və onun pak ardıcılları üçün kədərdə olur. Buna görə də

.əzadarın bütün varlığı ibadi hala gəlir. Əzadarın aldığı hər nəfəs zikrə çevrilir

Bu yüksəklik nədən qaynaqlanır, haradan mənbələnir? Əba Əbdillah (ə) Aşura günü öz vəzifəsini icra etməsəydi, İslam adına kamil din qalmayacaqdı. Müsəlman toplumları üçün tamamlanmış nemət həyata keçməyəcəkdi. İslam və dindarlıq bəyənilmiş hala çatmamış olacaqdı. İmam Hüseyn (ə) öz hərəkatı ilə imanı yaşatdı, dini məhv olmağa qoymadı. Bu yolda öz canını verdi. Əzadar da öz iradəsi ilə bu məktəbi yaşadır, faktiki .olaraq, bu hərəkatı davam etdirir

**Rəsulallahın (ə) insanlığa İmam Hüseyn (ə) xəbərdarlığı**

Coğrafiyasından asılı olmayaraq, dünyanın harasında ki, İmam Hüseyni (ə) sevənlər var, məhərrəm ayı gələn kimi o toplumun halı dəyişir, ruhiyyəsi əvəzlənir, ovqatı dəyişir, hətta geyimi də dəyişir. Bir, iki, on il deyil, əsrlərlə insanların içərisində belə bir hal var. İnsanların içərisində bir həratər, sızıltı var. İmam Hüseynin (ə) adı gələndə, həmin sızıltı, hərarət onu hərəkətə gətirir. Əziz İslam Peyğəmbəri (s) bu istiqamətdə çox nurani bir xəbərdarlıq edir. Əziz Rəsulallah (s) insanlığa, bəşərə xəbərdarlıq edib ki, imanı olan insanların içərisində xüsusi hərarət mövcud olar. Həmin hərarət Əba Əbdillah (ə) ilə bağlıdır. Həmin hərarət heç bir zaman sönmür və soyumur. Qiyamət gününə qədər həmin istilik və hərarət öz təsirini göstərməkdədir. Həzrət Peyğəmbər (s) mübarək hədisdə buyurur: "Möminlərin qəlbində İmam Hüseynin (ə) şəhadəti ilə bağlı bir hərarət var ki, heç vaxt sönməyəcək və soyumayacaq". Həzrət Peyğəmbərin (s) İmam Hüseyn (ə) barədə xəbərdarlıq etdiyi istilikdir ki, indi bizi əzadarlıq

məclislərinə aparır. Həmin hərarətdir ki, İmam Hüseyni (ə) sevəni məhərrəm ayı daxil olarkən hərəkətə gətirir.

## Hüseyn (ə) əzadarlarının halı dəyişər

Əxlaq ustadları, ariflər Məhərrəm-Səfər əyyamı ilə bağlı xüsusi tövsiyələr edir. Xüsusilə, onların tövsiyələri əyyamın birinci ongünlüyü ilə bağlıdır. Dəyərli tövsiyələrdə buyurulur: "Bu ongünlükdə məqsədəuyğundur ki, Əhli-beyt (ə) dostlarının halı dəyişsin, qəlblərində və üzlərində böyük və ağrılı müsibətin qəminin və ağrısının əlamətləri görsənsin. Allaha və Rəsuluna (s) sevgi, vəfadarlıq və iman buna hökm edir."

Bəli, gərək bu ayda hallarımız dəyişsin. Qəlblərimizdə, üzlərimizdə bu böyük və ağrılı müsibətin qəminin və ağrısının əlamətləri görsənsin. Əgər iman sahibiyiksə, içərimizdə bu istilik və hərarət varsa, bu hərarət hallarımızın dəyişməsinə səbəb olacaq. Biz onsuz da həmişə bu dünyanın məşğuliyyətləri, cürbəcür əyləncələri ilə başımızı qatırıq. Dünyanın işləri hamımızı məşğul edib. Kimsə düşünürsə ki, beş işi olacaq və onları qurtarandan sonra Allaha bəndəlik edə biləcək, yanılır. O beş işi görüb qurtardıqdan sonra insan görəcək ki, daha on beş işi çıxıb. Bunlar niyə həll olub qurtarmır? Çünki, insanın içərisində sönməyən nəfsani istəklər var. Onlar şölələnir, alovlanır, alovlandıqca da insanı müxtəlif işlərin ardınca olmağa motivləşdirir.

## Daxilimizdə də bir Kərbəla var

Gedək Kərbəla səhnəsinə... Kərbəla səhnəsinin tərəfləri bəllidir. Bir tərəfdən Həzrət Peyğəmbərin (s) nəvəsi İmam Hüseyn - Əba Əbdillah (ə), digər tərəfdə isə Yezid (lən).

Amma bu səhnə həm də bizim içərimizdə mövcuddur. Müsbət daxili tutumumuz, ağlımız, mənəvi halətimiz bir şeyi deyir, nəfsani istəklər isə insanı başqa istiqamətə aparır. Bunlar hər gün içərimizdə toqquşur, hər gün içərimizdə savaş gedir. Bizim daxilimdə də bir Kərbəla var. Hər zaman ki, nəfsani istəklər qalib gəlir, o zaman içərimizdəki Yezid (lən) qalib gəlir. O zaman insanın öz müsibəti başlayır. Biz hər gün bu müsibəti yaşayırıq. Bir tərəfdən daxilimizdəki mənəvi hal bizi müsbətliklərə doğru aparır, digər tərəfdən isə nəfsani istəklər bizi uçuruma doğru aparır. Bunlar hər gün içərimizdə toqquşur. Bəzən vəziyyət o qədər pisləşir ki, içərimizdəki yezid (lən) daha .çox hallarda qalib gəlir

İnsan hər şeyə vaxt çatdırır, bircə özündən başqa. İnsan özü ilə məşğul olmur. Zaman baxımından Ərəbistan coğrafiyasında da vəziyyət o cür idi, indi də bu cürdür. Texnoloji inkişaf vəziyyəti bir qədər də qəlizləşdirib. Nəfsani istəklər bir qədər də .rəngarəngləşib. Hər şey daha əlçatan olub

İmam Hüseyn (ə) özü də bu hərəkatın hədəfini belə açıqlayır ki, "Mən əmr-be-məruf və nəhy-əz-munkər üçün, yaxşılıqlara dəvət və pisliklərdən çəkindirmək üçün ayağa qalxdım". Qiyamətə qədər bu məktəb, bu təlim həmin missiyanı həyata keçirdir. Hər zaman müsəlman toplumlarının yoldan sapmış haldan düz yola qayıtması üçün Kərbəla məktəbi canlı bir məktəbdir. Bu, təkcə o dövrdəki insanlar üçün ibrət götürülməli məsələ deyil. Biz günümüzdə də hər birimiz hər an, hər dəqiqə hər məkanda haqla batil arasında seçimdəyik. Nəfsani istəklərmizin ardınca getməyin və bunun əksi olan - Allaha doğru yönəlişlər arasında seçimdəyik. Hərəmizin içində bir Hüseyn (ə) var. Hərəmizin içində yezidlər (lən) də var. Biz

bunların arasında seçimdəyik. Allaha bağlantıya tərəf yönələ bilərik, nəfsimizin istəklərinə tərəf də yönələ bilərik. Şəhvətin, qəzəbin, bütün mənfiliklərin cəzzabiyyəti ilə həyat bataqlığında Allahı unudaraq, məhv ola bilərik və yaxud da Allahın .dərgahında olmağımızın fərqinə varıb, Allaha tərəf yönələ bilərik

İçimizdə bir Kərbəla meydanı var. Həmin iştirakçılarla birlikdə içimizdə davamlı, daimi bir Kərbəla meydanı var. Bu meydanda, bu döyüşdə Allaha tərəf sövq edən tərəfi qalib gətirə biləriksə, içimizdəki Hüseynlərin yanında ola biləcəyiksə, varlığımızdakı aliliklərin, gözəlliklərin yanında ola biləriksə, həmd olsun Allaha. Bu, çox diqqət olunmalı məsələdir. Eyni zamanda təkcə içimizdə deyil, ictimai həyatımızda da, həyatımızın bütün səhnələrində də belə seçim qarşısındayıq. Ona görə də əslində, Kərbəladan götürüləcək ən böyük dərslər bu hədəfə - islaha yüklənməlidir. Fərdin islahı, toplumun islahı, içimizdəki dəyişikliklər, toplumdakı dəyişiliklər, insanların dəyişməsi, Allahla öz rabitələrini bərpa etmələri – budur İmam Hüseynin (ə) hədəfi. .Allahdan bu istiqamətdə hər birimizə öz lütfünü əsirgəməməyini istəyirik

Əba Əbdillah (ə) və Əhli-beytin (ə) böyüklüyü bundadır ki, savaşlarında əql və mənəvi tutumları həmişə, hər zaman qalib gəlib. Onlar nəfsani istəklərini nəzarətə ala biliblər, daima cilovlaya biliblər. Bu nəfsani istəkləri nəzarətə aldıqdan sonra mənəvi tutum üstün gəlir. Əgər nəfsani istəklərin dəyəri olsaydı, onların həyatımızda üstünlük təşkil etməsinin həyatımıza müsbət təsiri olsaydı, Əba Əbdillah (ə) onları seçərdi. Əgər Əhli-beyt (ə) nəfsani istəklərin üstünlüyünü, onların prioritetliyini seçməyiblərsə, deməli onların heç bir dəyəri yoxdur. Tarixin sözün ən müsbət mənasında ən zirək insanı Həzrət Əmirəlmömininindir

ə), İmam Əlidir (ə). Amma, Əmirəlmöminin (ə) bunları seçməyib. Dünya özünü təqdim) .edəndə də Həzrət Əli (ə) bunu seçmir

**Aşura bir tarix, Kərbəla bir məkan deyil**

Kərbəla – yalnız coğrafi məkana və tarixi zamana aid olan bir hadisə deyil. Kərbəla – hər dövrə, hər zamana, hər məkana aid olan bir məsələdir. Kərbəla – hətta bizim daxilimizə də aid olan məsələdir. Bizim daxilimizdə bir Kərbəla mərəkəsi var. Aşura bizim içimizdədir. Əba Əbdillah (ə) – bizim içərimizdəki müsbət yüklü mənəvi tutumumuzdur. Hər an bizi tövbə etməyə, düz yola gəlməyə çağırır. Hər an ölümü bizim yadımıza salır. Yadımıza salır ki, artıq qocalmağa doğru gedirik. İçərimizdə mövcud olan həqiqət hər gün bizə yaşadığımız bu dünyanın müvəqqəti olduğunu .bildirir. Bunlar sanki içərimizdə Əba Əbdillahın (ə) mübarək qoşunudur

İçərimizdə Yezid (lən) də var. Qəzəblidir, şəhvətlidir, hər zaman nəyisə istəyir, heç nə ona bəs etmir. İçərimizdə bu mərəkə var, bu savaş var. Hər gün içərimizdə olan Əba Əbdillah (ə) qoşunu ilə Yezid (lən) qoşunu qarşı-qarşıya gəlir. Hər gün ki, nəfsani istəklərimiz içimizdə qalib gəlir, sanki içimizdə olan Yezid (lən) qələbə çalır. Bir Rüqəyyə, bir Əli Əkbər, bir Əli Əsğər məzlum olur içimizdə. Hər gün, hər həftə nə qədər Zeynəbləri (s.ə) içimizdə ağlar qoyuruq? İçimizdə nə qədər Əba Əbdillahın (ə) ?əhdini qırırıq? İçimizdə nə qədər bu hal olur

Aşura bir mücərrəd mövzu deyil. Hər günümüz Aşuradır. Hər günümüz seçimdir. Öz içərimiz, daxilimiz Aşuradır. Aşuranın bütün iştirakçıları içərimizdədir. Biz nə halda, nə vəziyyətdəyik? Kimin tərəfindəyik? Daxilimizdəki

cəngin nəticəsi nə olur? Aşura ideallarına nə qədər sadiqlik – bu cəngin, bu savaşın .nəticəsini məhz bununla şərtlənir

### Xalqın hər il yaşadığı mənəvi kədər

Bizi tərbiyə edəcək pak və mübarək Məhərrəm-Səfər əyyamının xüsusiyyətlərindən biri budur ki, biz bir neçə baxımdan düzələ bilərik. Birinci tərəfdən, içərimizdə olan .istilik işə düşür. Əba Əbdillahın (ə) adı gələndə istər-istəməz hərəkətə gəlirik

İnsanları bir çox başqa şeylər ətrafında toplaya bilirlər. Bütün televiziya, təbliğat vasitələri bunun üçün işləyir, amma uğur qazana bilmirlər. Amma əsrlərdir ki, xalqın, elin içərisində Əba Əbdillaha (ə) əzadarlıq məclisləri yaşadılır. Bu xalq doğurdan da böyük xalqdır. Dünyada neçə belə xalq var ki, Məhərrəm ayı gələn kimi şadlıqlarını, toylarını dayandırır? Bu, hələ o durumda baş verir ki, televiziyalar bu xalqın ixtiyarında deyil. Əgər xalqa xidmət etsəydi, xalqın duyğuları ilə yaşasaydı, onlar da iki ay .müddətinə ən azından ədəb-ərkana riayət edərdilər

Əba Əbdillah (ə) məktəbini hər zaman xalq, el-oba yaşadıb. Daxildən istilik olub və bu .istilik insanları hərəkətə gətirib

### ...Əgər dünyanın bir dəyəri olsaydı

Bu müsibətin yaşadılmasının ikinci tərəfdən tərbiyəedici xüsusiyyəti var. Əba Əbdillaha (ə) baxan insan anlayır ki, əgər dünyanın bir dəyəri olsaydı, İmam Hüseyn (ə) Mədinədən yola çıxıb bu işləri görməzdi. Əgər İmam Hüseyn (ə) dünya dalınca olsaydı, altıaylıq balası Əli Əsğərin, (r.ə), Əli Əkbərin (r.ə) Aşurada nə işi var idi? Əgər İmam ?Hüseyn (ə) dünya dalınca olsaydı, Həzrət Zeynəbi (s.ə) niyə Kərbəlaya gətirirdi

Bu məktəbi yaşatmaq və diri saxlamaq ona görə də hər bir insanın borcudur. Xüsusilə gənclərin Kərbəla məktəbinin yaşadılmasında böyük rolu var. Bu irs illər ərzində yaşadılaraq, bizlərə təhvil verilib. İndi bizim, xüsusilə gəncliyin borcudur ki, Kərbəlanı yaşatsın, ona sahib çıxsın. Bəzi insanlar olacaq ki, mərsiyənin, növhənin, rövzənin, sinə vurmaların lazım olmadığını iddia edəcək. Tarixən də belə insanlar olub. Bunların .hamısı Kərbəla məktəbini aradan aparmaq üçündür

## Bizə çatan bərəkətlər – Kərbəladandır

Böyük alimlərimizdən biri tövsiyələrində buyurur: "O sünnəti rövzələri və o müsibətləri diri saxlayınız. Bizə çatan nə bərəkət varsa, onlardandır. Bu bərəkətlər – Kərbəladandır. Kərbəla və Seyyiduş-Şühədanın (ə) mübarək adını diri saxlayınız ki, onun diri qalması ilə İslam diri qalır". Rövzə və mərsiyələri diri saxlamaq – o deməkdir ki, onları qorumalıyıq, yaşatmalıyıq. Əzadarlıqlar təşkil olunmalı və həmin əzadarlıqlarda İmam Hüseynin (ə) Kərbəla müsibəti insanlara çatdırılmalıdır. Necə ki, İmam Hüseyn (ə) Kərbəlanı yaşamaqla İslamı diriltdi, onu bir din olaraq aradan getməyə qoymadı, eləcə də Kərbəla müsibətini diri saxlamaqla İslam dininin diri qalmasına səbəb olarıq. Bizim əldə etdiyimiz bütün bərəkətlər – İmam Hüseynin (ə) .əzadarlığındandır

## Hər bir Hüseynçinin üzərində olan məsuliyyət

Hər il dünyanın istənilən yerində yaşayan Hüseyn (ə) aşiqləri, Hüseyn (ə) əzadarları Məhərrəm əyyamı başlayandan İmam Hüseyn (ə) hərəkatının yalnız tarixi deyil, həmişəyaşar, diri bir fenomen olmasını, bunu

yaşatmaları ilə təsdiqləyirlər. Məhərrəm ayının onuncu günü – Aşura günü baş verən bu hadisəni ildən-ilə, əsrdən-əsrə ötürərək, bu günü bir təqvim günündən daha .yüksəklərə qaldırırlar

Məhərrəm-Səfər əyyamını yaşatmaq hər birimizin üzərindədir. Böyük alimlərdən birinin buyurduğu kimi, bu əyyamın yaşadılması vacibi-kifayədir, yəni hər kəsin üzərindədir. Aşuranı yaşatmaq, Məhərrəm-Səfər əyyamını yaşatmaq – hər kəsin üzərindədir. Necə ki, dünyadan bir müsəlman köçəndə bir qrup onun dəfni ilə məşğul olana qədər həmin insanın dəfn olunması hər kəsin üzərindədir və əgər bir qrup onun dəfn mərasimi ilə məşğul olsa, bu zaman digərlərinin boynundan bu vəzifə götürülmüş olur – o cür də məhərrəm-səfər əyyamını yaşatmaq da belədir. Bu, hər birimizin üzərindədir. Bəli, kimlərsə bunu yaşatmağa başlayarsa, biz də gedib kömək edərik. Amma bu baş verməyənə qədər, hər kəsin üzərindədir. Bu qədər bu əyyamın .yaşadılması baxınmından üzərimizdə Allah qarşısında məsuliyyət var

Bizim el-obamızın, ata-babalarımızın, ağsaqqal-ağbirçəklərimizin qarşısında bu məsuliyyətimiz var. Hansı ki, Sovetin ən ağrılı dönəmində, ən ağır illərində bu əyyamı yaşadıblar. Bu əyyamın yaşanmasını qoruyublar. İçlərindən təbii olaraq gəlib bu. Günümüzdə də bu yaşanır. Təbii yaşanır. İnsanların içindən gələrək yaşanır. Bu, xalqın içindən gələn bir məsələdir. Bizim məmləkətimizdə çox az məsələlər var ki, o günlər gələndə, o hadisələr olanda insanların içindən gəlmə bir hərəkətlənmə olur. Məhərrəm də belə hadisələrdəndir. Elə bir hadisə, elə fenomen tapa bilmərik ki, xalqın iki ay müddətlik həyatına təsir göstərmiş olsun. Bir il deyil, iki il deyil, on il deyil, yüz il deyil - hər il

bu hal təkrarlanmış olsun. Hər il xalq qərara gələ ki, iki ay biz belə yox, başqa cür .yaşayacağıq

## İmam Hüseynə (ə) məhəbbət – fitrətdədir

İmam Hüseynə (ə) məhəbbət insanın fitrətindən gəlir. İmam Hüseynə (ə) sevgi – gözəlliklərə sevgidir. Bu müsibətdə, faciədə üz-üzə gələn tərəflər - haqla batildir. Bu müsibətdə gözəlliklərlə eybəcərliklər qarşı-qarşıya gəlib. Bir tərəfdə İmam Hüseyndir (ə), digər tərəfdə lənətlik Yeziddir. Bir tərəfdə bəşərin ən alisi, ən gözəli - Hüseyndir (ə), bir tərəfdə bəşərin ən eybəcəri - lənətlik Yezidddir. Bir tərəfdə Abbaslar, Əli Əkbərlər, Əli Əsğərlərdir, Həbiblərdir, Hürrlərdir – insanlığın ən nəcib, ən fədakar, ən şücaətli şəxsiyyətləridir. Digər tərəfdə isə ən iyrənc, ən zəlillərdir – şimrlər, ömər .sədlər, ibn ziyadlar, hərmələlər və digər tör-töküntülərdir

Həmd olsun Allaha ki, xalqımıza bu xeyirlə şər arasında sərhədi bilmək nəsib olub, bu duyğuları yaşatmaq nəsib olub. Həmd olsun Allaha ki, məmləkətimizdə Aşura yaşadılır - xüsusən də gənclər tərəfindən. O gənclərin, o yeniyetmələrin əllərindən öpülməlidir ki, bu əyyamın günlərində, Tasua, Aşura günlərində Əba Abdullahın (ə) bayrağını götürüb, piyada ziyarətgahlara gedirlər. Onlar İmam Hüseyni (ə) yaşadırlar. Ədəblə, .ərkanla, içdən gələn duyğularla yaşadırlar

## Duyğuların təzahürü

Məhərrəmliyi yaşatmaq, ruhu məhərrəmlik ovqatına gətirmək mövzusu, İmam Hüseynə (ə) göz yaşı tökmək mövzusunun açıqlanmasını labüd edir. Məhərrəmlik əza ayıdır, əzadarlıq ayıdır. Bir aydır ki, burada Əba Əbdillahın (ə) müsibətini yaşatma baş verir. Bu ayda müsəlmanar

İmam Hüseynin (ə) başına gələn müsibəti yaşayırlar. İnsanlar bu dönəmdə əzadarlıq edirlər. Şüurlu surətdə, iradəvi surətdə insanlar qəmli olarlar məhərərəmlikdə. Necə Qədir-Xum günü şadlanmaq, şadlıq zəminləri yaratmaq günün əməllərindəndlir, Aşura günü də qəmlənmək günün əməllərindəndir. Dinimiz Qədir-Xum günündə müsəlmanın iradəvi şadlanmasını necə istəyirsə, məhərrəm dönəmində də iradəvi qəmlənməsini .istəyir

Bunun iradəviliyindədir bərəkət. Təbərrüklük - qəm fəlsəfəsini dərk edərək, iradəvi surətdə bunu yaşatmaqdan qaynaqlanır. Bu müsibəti yaşatmağın, əzanı saxlamağın .ayrılmaz xüsusiyyəti, ünsürü - səmimi göz yaşlarıdır

### ...Göz yaşı necə cür olur

Araşdırmalar ۷ cür göz yaşının mövcudluğunu bəlli edir. Burada birinci yeri körpənin ağlaması tutur. İnsan həyatı bununla başlanır, balaca insanın sağlıq durumu, qidaya .ehtiyacı bununla bilinir. Ağlama bir müddət uşağın dili rolunu oynayır

Burada bir təbərrük nöqtə qeyd edilməlidir. Uşaq dünyaya gəldikdə necə ağlayırsa, Əba Əbdillaha (ə) göz yaşı axıdan kəs də sanki dünyaya gəlir. Və həmin göz yaşı, riqqətli qəlbin, ruhun sağlamlığının göstəricisidir. Bu göz yaşı - onun halının, vücudunun ...bir dilidir

Bəzən sevinc və şadlıqda da bu şövq ağlaması baş tutur. Və yaxud, insan fədakarlıq səhnələrini

görəndə də şövqdən ağlaya bilir. Mübarizə ruhlu bir şeir dinləyir, mahnı eşidir – sanki itirilmiş nələrinisə tapır, həyəcanlanır, biixtiyari göz yaşları axıdır.

Üçüncü növ ağlama – duyğu və məhəbbət göz yaşıdır. Sevgi, məhəbbət və göz yaşları – bunlar biri-birinə bağlı anlamlardır. Bir-birilə mülazimə halındadırlar, lazım vəziyyətindədirlər. Göz yaşı – məhəbbətin şiddətinin göstəricilərindəndir.

Dördünü növ – çox incə bir ağlama növüdür – tanıma, mərifət, məsuliyyət göz yaşı. İnsan Rəbbini tanıyır, Rəbbinin əzəməti haqqında təfəkkür edir – bunun nəticəsində göz yaşı axıda bilir. İlahi, bu necə yaranış, bu necə əzəmət, bu nə cür nizam?! Necə olur belə kamil xəlqiyyət?! Bu tanıma, bu dərk etmə göz yaşları çağıra bilir. Tanıdıqca, həmin bu göz yaşları əmələ gəlir.

**Hədəfə bağlantı**

Bir var cahiliyyətin göz yaşı, bir də var arifin, tanımanın göz yaşı. Tanıma artdıqca, ariflik artdıqca, göz yaşlarının əmələ gəlmə keyfiyyəti də dəyişir. Məsuliyyət artdıqca, həmin bu məsuliyyətdən irəli gələn göz yaşları da yaranır. Məsuliyyətin fərqinə varmaqla, məsələnin əhəmiyyətini dərk etməklə üzə çıxan göz yaşları buraya aiddir.

Ağlamanın vücuda gələn digər səhnəsi peşmançılıq göz yaşı ilə bağlıdır. Beşinci növə aid olan bu göz yaşları insanın tövbəsini, əməlindən peşmançılıq hissi keçirməsini təzahür edir. İnsanın qayıdışı, islahatı tövbəyə bağlı olan bir məsələdir. Bu da göz yaşları ilə müşayiət olunan bir haldır.

Altıncısı – hədəfə bağlantı ilə bağlı olan göz yaşıdır. Hədəf nədirsə, göz yaşının keyfiyyəti də o cürdür. Bir

insandır, ölkəsinin himnini dinləyir. Himndəki sözlərlə həmahəng olur. Ali hədəflərə, dəyərlərə beyət etmə göz yaşlarından gedir söhbət. İnsan şəhidləri xatırlayır, onların ali məqsədlərini, ali hədəflərini, ali duyğularını, ali amallarını xatırlayır. Onlarla birgə olmaq, həmahəng olmaqdan irəli gələn göz yaşları olur. Onlara bağlantıdan irəli gələn .göz yaşlarıdır bunlar

Şəhidə ağlamaq – əslində amallara bağlantıdan irəli gələn göz yaşlarını izhar etməkdir. .Onlarla vücudi beyətini edir, hədəfləri ilə beyət etməyini izhar edir ağlayan insan

Ağlamağın yeddinci növü isə zillət və məğlubiyyət ağlamasıdır. O insanın ağlamasıdır ki, zəifliyindən, zəlilliyindən, məğlubiyyətindən ağlayır. Bu ağlamaq bir başqa .ağlamaqdır. Bu göz yaşları insanı daha daha da zəiflədir, ruhdan salır

Əba Əbdillah (ə) üçün tökülən göz yaşlarında. Kərbəla qəhrəmanlarını yada salanda hər bir insan kövrəlir, qəhərlənir. Hər bir şey var burada, bu göz yaşlarında. Amma zillət və məğlubiyyət yoxdur. Əksinə, izzətin mənbəyinə bağlayan göz yaşları var burada. Qorxaqların göz yaşları yoxdur Kərbəla vaqiəsinə ağlamaqda. Əksinə, şücaətlilərin göz yaşı var burada. Ümidsizliyin göz yaşı yoxdur, ümidverən göz yaşları var burada. İmam Cəfər Sadiqdən (ə) nəql edirlər: «Hər bir müsibətdə ağlamaq və tabsızlıq göstərmək – bəndə üçün məkruhdur, xoşagəlməzdir. Amma Hüseyn ibn Əli .«(ə) üçün ağlamağın əcr və savabı var

İmam Hüseynə (ə) ağlamaqda ۷ ağlamağın yeddincisi yoxdur, zəlillik və qorxaqlıq göz yaşları yoxdur burada. İslam qəbul etmir zəlillik və acizliyin ağlamasını. İslam insanı .kamilliyə, quruculuğa aparan hər şeyi qəbul edir və zillətə aparan hər şeyi rədd edir

## Qiyamətdə ağlamayan gözlər

İmam Hüseynə (ə) məhəbbətin göz yaşları... Məhəbbətdən irəli gələn bir göz yaşları. Bu göz yaşları, bu məhəbbət gunahları bağışladar. İmam Rzadan (ə) nəql edirlər: “Ağlamaq istəyən şəxs İmam Hüseynə (ə) ağlasın. Çünki, o Həzrətə ağlamaq günahların bağışlanmasına səbəb olur.”

Özünəqayıdış əyyamıdır məhərrəm-səfər. Günahların bağışlanması dönəmidir. Həzrət İmam Hüseynə (ə) ağlamaq – qəlbdən gələn bir sadiq və sabit hissin, ülvi bir məhəbbətin təzahürüdür. Bu məhəbbəti qəlbində gəzdirən isə gözəllikləri sevməyə və eybəcərliklərə ikrah hissi bəsləməyə gəlib yetişər.

İmam Hüseynə (ə) məhəbbətdən irəli gələn göz yaşları Qiyamət günü Hüseynsevərlərin gözünü şad edər. İslam Peyğəmbəri (s) öz qızı Həzrət Fatiməyə (ə) xitab edərək belə buyurmuşdur: “Fatiməcan! Qiyamət günü bütün gözlər ağlarkən, Hüseynimə ağlayan gözlər gülər və cənnət nemətlərilə müjdələnər.”

O göz yaşları Kövsər suyu ilə Hüseyn aşiqini sirab edər. İmam Sadiqdən (ə) belə bir buyuruş var: “Bizə ağlayan gözlər Kövsər hovuzunun suyu ilə sirab olacaq.”

## Əhli–beytin (ə) müsibətinə kədərlənmək – ibadətdir

Növbəti nöqtə olaraq, Əhli-beytin (ə) müsibətinə kədərlənməyin fəlsəfəsinə toxunaq. İmam Cəfər Sadiqdən (ə) belə bir hədis nəql edilir: “Bizim məzlumiyyətimizə görə kədərlənən hər bir şəxsin nəfəsi təsbihdir və onun bizim üçün olan qəmi - ibadətdir.”

səh:۳۵

Hədisdə olan mətləblərə diqqət etsək, burada Əhli-beytə (ə) olan zülmü dərk etmək, bu zülmün mahiyyətini anlamaq, buna kədərlənməkdən söhbət gedir. Əhli-beytə (ə) zülm edən kimlərdir? Zalımlar. Nəyə görə Əhli-beytə (ə) zülm edirlər? İlahi həqiqətləri dediklərinə görə, haqqa çağırdıqlarına görə. Deməli, bu duyğuları yaşayan insan, Əhli-beytin (ə) müsibətinə şərik olan insan, həmin hissləri keçirir və ən başlıcası - bu dəyərləri qəbul edir, onların daşıyıcısına çevrilir. Beləliklə, Əhli-beytin (ə) müsibətini dərk edib, kədərlənən insanın nəfəsi təsbih olur, yəni sanki «sübhənallah» deyir, Allahı vəsf edir. Eyni zamanda bu kədərin özü də ibadətdir. Niyə? Çünki, həmin kədər İlahi dəyərlərə sadiq olmanın təzahürüdür. Doğrularla olub, pisləri, şəri inkar etməyin .təzahürüdür

Məhərrəm-səfər əyyamında insanın ruhi yüksəlişi üçün fövqəladə fürsətlər vardır. Həqiqətdə bu hissləri qiyabi keçirmək olmur. Bu hissləri yaşadan, insanın qəlbini oyadan məclislərin, əzadarlıq məclislərinin misilsiz əhəmiyyəti başa düşülür. Belə olan halda, bu məclisləri söngitmək, şəhidlik fəlsəfəsini aradan aparmaq - insanları manqurtlaşdırmaq, laqeydləşdirmək istəyinin bilavasitə təzahürüdür. İnsanlarımız .ayıq olmalı, İmam Hüseynin (ə) müsibətinə şərik olmaq fürsətini əldən verməməlidir

**?Şəfaət nədir**

Həzrət İmam Hüseynin (ə) digər bir mübarək xüsusiyyəti ki, zikr olunmalıdır – .şəfaətdir

Şəfaət məfhumunu tam anlamaq üçün və İmam Hüseynin (ə) insanlar üçün şəfaətçi olmasının nədən ibarət olmasını dərk etmək üçün, bizlərin bu şəfaətə nail olmamız üçün nələrin edilməsinin lazımlı olmasını bilmək üçün bu məfhumun müxtəlif .müstəvilərdə açılışına diqqət edək

Öncə “şəfaət” sözünün lüğətdə anlamına nəzər salaq. Şəfaətin lüğət anlamında kökü – bir şeyi özü kimisinə, oxşarına əlavə etmək, qoşmaq mənasına gəlir. Əgər bir şey bir .kəs tərəfindən özü kimisinə qoşulsa, buna lüğəti mənada “şəfaət” deyilir

Buradan aydın olur ki, şəfaətin baş tutması üçün, iki tərəf arasında bir növ oxşarlıq olmalıdır. Şəfaət edənlə şəfaət olunan arasında uyğunluq olmalıdır, ümumiyyətlə fərqli cəhətləri olsa da belə. Şəfaətçinin kimisə şəfaət etməsi üçün onların ümumi cəhətləri .olmalıdır

Mübarək dinimizin nəzərində şəfaətin izahı da budur ki, günahkar insan İlahi övliyalara iman və əməl kimi müsbət cəhətlər baxımından oxşarlıq əldə edər, nəticədə ilahi övliyalar onun əlindən tutar, kömək edər, kamala tərəf qaldırar – Allahın dərgahında onun üçün əfv diləyərlər. Yəni, insan xəta və səhvlə dolu bir yükün altında olsa da belə, dəqiq müsbət cəhətləri olmalıdır ki, şəfaətə layiq olsun. Və bu müsbət cəhətlər, ilk növbədə, iman və əməl müstəvisində olmalıdır ki, şəfaət verən Allah övliyası ilə cüzi də .olsa, böyük mərtəbə fərqi ilə də olsa, amma ortada bir ümumilik olsun

Şəfaətin həqiqəti budur ki, daha güclü və kamil varlıq daha zəif və naqis varlığın onun müsbət oxşar xüsusiyyətlərinə görə yer tutmasına yardım edir və onun əlindən tutub onu kamal mərhələlərini aşmağa kömək edir. Şəfaətdə mütləq şəfaətçinin yardımı, duası, köməyi var ki, bunun sayəsində şəfaət olunan kamal dərəcələrini fəth etməyə .müyəssər olsun. Günahları bağışlansın və mərtəbəsi yüksəlsin

**Əhli–beytə (ə) sevgi insanı paklaşdırır**

Məsum İmamlarımızdan (ə) da bu səpkidə buyuruşlar var ki, insanın dünyaya məhəbbəti – bütün xətaların başıdır. İnsanın nə xətaları varsa, ora qayıdır. Bizim işlərimizin, əməllərimizin, rəftarlarımızın hədəfi dünya olan yerdə, dünyaya məhəbbət mərəz rolunda çıxış edir. Hədəfə çevrilsə – nə etsək də, xeyri yoxdur, xəta olacaq. Bu məclislərin bir nuraniyyəti də odur ki, Əhli-beytə (ə) sevgi, ona bağlılıq insanı paklaşdırır. Bu məclislərdə müalicə olunmaq potensialımız realizə olunur. "Hüseyn! Hüseyn!" dedikcə qəlblərimizdə İmam Hüseynlə (ə), bütün gözəllikləri özündə cəm edən İmamla (ə) bir həmahənglik meydana çıxır. Biz bu əyyama sağalma, müalicə .əyyamı kimi baxmalıyıq

**...Burada qurban olmaq niyyət olaraq qalmır**

Bu əyyamda İmam Hüseyn (ə) yad edilir. Necə ki, həcc ziyarətində qurbangahda Həzrət İbrahimlə (ə) Həzrət İsmayılı (ə) yad edirik, Səfa-Mərvə arasında Hacər xanımı yad edirik, onun təlaşını yad edirik, Həzrət İbrahimin fədakarlığını yad edirik – hansı ki, elə həccin fəlsəfələrindən biri də budur ki, insanlar Həzrət İbrahimin (ə) fədakarlığını .dərk etsinlər – eləcə də biz bu məclislərdə İmam Hüseyni (ə) yad edirik

Necə də Kərbala və İmam Hüseyni (ə) yad etməyək, bir halda ki, İbrahim (ə) əziz övladını qurban kəsmək istəyirdi, İsmayıl (ə) da qurban olmağa hazır idi, amma buna ehtiyac olmadı, Allah Təala qurban göndərdi. Kərbalada da İmam Hüseyn (ə), onun balaları, yaxınları Allah yolunda qurban olmaq istəyir. Amma burada bir fərq var: onların bu istəyi həyata keçir. Kərbala qurbangahında Allah dərgahında həmin insanlar nəinki niyyətdə qurban olurlar. Onlar əmələn Allah yolunda qurban olurlar. Biz necə İmam Hüseyni (ə), səh:٣٨

bu şəhidləri anmayaq?! Bunları həcc xatırlamalarından da qat-qat çox anmalıyıq. Çünki burada qurban olmaq bir niyyət olaraq qalmır, İmam Hüseyn (ə) və onun yaxınları timsalında həyata keçir. Biz həcdə Səfa ilə Mərvə arasında səy əməlini yerinə yetirməklə susuz bala İsmayılı (ə) yad edirik, amma o susuzluqdan şəhid olmur, susuz halda dünayadan getmir, Allah ona Zəm-Zəm nəsib edir. Amma Kərbalada təşnə, susuz balalar susuz halda dünyadan gedirlər. Əli Əsğər bala atasının qucağında susuz halda, dodaqları qurumuş halda boğazından oxlanır. Burada qolları kəsilən Əbülfəzl (ə) var, susuz balalara görə dodaqlarına su aparmayan Əbülfəzl (ə) var. Burada Əli Əkbər (ə) var, Qasim var, burada tikə-tikə doğranmış Hüseyn (ə) var, burada Rüqəyyə (s.ə) var, burada Zeynəb (s.ə) var. Biz necə bunları anmayaq?!

Aşura günü bu müsibətləri törədənlər haradansa gəlməmişdilər, onlar zahirdə müsəlmanlar idi, zahirdə namaz qılanlar, oruc tutanlar idi. Onlar zahirdə imanlı qiyafə ilə bu cinayətlərə qol qoyurdular. Deməli, zahirən müsəlman olmalarına, imanlı qiyafəsində olmalarına rəğmən, içlərində qorxulu mərəzlər var imiş. O mərəzlər Aşura dönəmində hərədə bir cür üzə çıxdı. Birində məqam, vəzifə mərəzi olur və bu mərəz Aşurada hər şeyi üstələyir. Birinin dünyaya məhəbbəti, pula, mala düşkünlük mərəzi var idi. Bunu özü üçün vasitə deyil, hədəf seçmişdi. Bu mərəz Aşura günü baş qaldırır və öz daşıyıcısını büdrədir. Onu İmamı (ə) qətlə yetirməyə qədər bir bəşəri cinayətə getməyə sürükləyir. Bir başqasının qorxaqlıq mərəzi var, onu da orada yaxalayır.

Hərəni bir cür yaxalayır. Birinin əqli mərəzi var, dar görüşə malikdir, hər şeyə ağ və

qara baxır və bunu müalicə də etməyib. Şübhələri var, dünyanın dərkinə gəlib çatmayıb. Bu mərəz də Aşura günü baş qaldırır və o da gəlib bu cinayətlərə əl qoyur. Kiminsə "mənəm-mənəm"lik xəstəliyi var. Şeytan lənətlik o mərəzi də yaxşıca himayə edir, onu yerbəyer edir. Və bir gün seçim vaxtı "mənəm-mənəm"lik ab-havası onu .bədbəxt edir

## İnsan özünü islah etməsə, seçim anında büdrəyəcək

Aşura bizə həm də arxayın olmamaq dərsi keçir. Yəni namaz qılırsan, oruc tutursan, ibadət edirsən – lap yaxşı, amma arxayın olma. Çünki bu xüsisiyyətlər zahirdə ola-ola insanlar Kərbəlada Peyğəmbər (s) balasını, cənnət cavanlarının ağasını tikə-tikə doğradılar. İnsanın ruhi naqislikləri, mərəzləri o qədər baş qaldırır ki, zəmanə İmamını (ə), yerlə səmaların bağlantı, ittisal səbəbini qətlə yetirir, tikə-tikə doğramağa qədər cəsarət edir. Buna görə Aşura məktəbi bizə arxayın olmamaq dərsi keçir. Namaz qılırsan, oruc tutursan, ibadət edirsən - nə gözəl, amma arxayın olma. Özünümüalicə ilə məşğul ol. Öz mərəzlərini tanı və onları müalicə et. Çünki mərəzlərini tanımasan, müalicə etməsən, onlar başı-başına qalacaq, bir gün sən hazır olmadığın durumda baş qaldıracaq. Əgər özünü islah ilə məşğul olmasan, seçim vaxtı gələndə haqqın yanında .deyil, batilin yanında olarsan

Aşuranın bizə öyrətdiyi ən böyük dərslərdən biri budur ki, özümüzün daimi, davamlı şəkildə müalicəmizlə məşğul olaq. Aşura cinayətkarları kimi özümüzü müalicəsiz buraxmayaq, dünyaya olan məhəbbətdə özümüzü müalicəsiz buraxmayaq, yoxsa bunlar kimi tənəzzül edib məhv ola bilərik. Çünki Aşura cinayətini törədən müsəlman toplumunun ən böyük müşkülü - daxili mərəzi olan dünyaya

məhəbbəti müalicəsiz qoymaları idi. Əgər bu müalicə ilə məşğul olmasaq, bir gün seçim vaxtı gələndə biz ayağımızı səhv yerə qoyacağıq. İnsanın xəbəri olmaz, bir də ayılar ki, Allah eləməmiş, İmam Hüseynin (ə) qarşısında dayanıb, Zəmanə İmamının (ə.f.) əleyhində dayanıb. Allahdan bu mənada tofiqat istəyirik ki, cəmən bizləri öz .müalicəmizdə müvəffəq etsin

## İmam Hüseyni (ə) tanıyaq

Təbərrük üçün İmam Hüseynin (ə) dediklərini zikr edək ki, o Həzrətin (ə) mübarək şəxsiyyəti ilə tanış olaq. Aşura günündəki kəlamlarının birində İmam Hüseyn (ə) buyurmuşdur: «Bilin! Bu haramzadə oğlu haramzadə məni iki yol arasında qoyub: qılınc və zillət! Zillətə qatlaşmaq bizdən çox-çox uzaqdır. Allah, Onun Peyğəmbəri, möminlər, (bizim tərbiyə olunduğumuz) pak ətəklər, qeyrətli qəlblər, alicənab ruhlar qəbul .«!etməzlər ki, biz alçaq bir başçıya təslim olmağı şərəfli ölümdən üstün tutaq

Hədis nəql edən ravilərdən biri deyir: «And olsun Allaha, övladları, ailə üzvləri və yoldaşlarının hamısı öldürülüb məğlub olmuş elə bir şəxs görməmişəm ki, Hüseyn kimi sakit və soyuqqanlı olsun. Düşmənin qoşunu mühasirə dairəsini sıxırdı, amma o, öz qılıncı ilə onlara hücum edirdi. Onlar da o Həzrətin qarşısından keçi sürüsü hücuma keçən canavarın qarşısından qaçan kimi qaçırdılar. O, düşmənin otuz min nəfərlik qoşununa hücum edir və onları milçək kimi dağıdırdı. Sonra: "Lə həvlə və lə qüvvətə illə billəhil-əliyyil-azim" ("Uca və əzəmətli Allahdan başqa güc və qüdrət yoxdur") deyib öz ."yerinə qayıdırdı

:Həzrət İmam Hüseynin (ə) digər buyuruşlarına da diqqət edək

."Allah rizasına xatir deyil), Allahı qəzəbləndirməklə xalqı razı salanlar nicat tapmaz)“

Allah, ilk vacib işlərdən birini yaxşılığa dəvət etmək və pisliklərdən çəkindirməyi“ buyurmuşdur. Çünki Allah bilir ki, bu iki ilahi vacibatın yerinə yetirilməsi digər vacib işlərin (istər çətin, istərsə də asan) görülməsinin asanlaşdırar. Səbəbi də budur ki, yaxşı işlərə əmr etmək və pis işlərdən çəkindirmək bütün insanları İslama doğru dəvət edər, haqq sahiblərinin hüquqlarını özlərinə qaytarar və zülm edənlərlə müxalifət ."edər

Ey insanlar, Allahın Peyğəmbəri (s) buyurmuşdur ki, hər kim Allahın haram“ buyurduğunu halal edən, Onun əhdini sındıran, Peyğəmbərinin sünnəsi ilə müxalifətçilik edən, öz rəiyyətləri arasında zülm və haqsızlıqla hökm edən zalım bir hakimi görüb, söz və ya əməllə ona qarşı çıxmasa, Allah Təala onu da zalım hökümdarı ."(düçar etdiyi əzaba düçar edər (yəni cəhənnəmə aparar

İnsanların çoxu dünya quludurlar. Din isə dillərində gəzir. Din sayəsində yaşadıqları“ ."müddətdə onu müdafiə edirlər. İmtahan zamanı gəlib çatdıqda isə dindarlar azalır

."Mən ölümü səadətdən, zalımlarla yaşamağı isə zəlillikdən başqa bir şey bilmirəm“

Ey Allah, Sən bilirsən ki, (fəsada qarşı mübarizə və) qiyamımız səltənət üçün və dünya“ malı yığmaq üçün deyildir. Bizim qiyamımız – Sənin dininin həqiqi əlamətlərini göstərmək, şəhərlərində islahat aparmaq, məzlum bəndələrini əmin-amanlığa ."çıxarmaq və vacib, yaxud müstəhəb ehkamlarını yerinə yetirmək üçündür

Mən azğınlıq, xüdpəsəndlik, fəsad və zülm etmək üçün qiyam etməmişəm. Mən“ cəddim Muhəmmədin (s) ümmətini islah etmək, yaxşılıqlara əmr etmək və

pisliklərdən çəkindirmək, cəddim Muhəmmədin (s) və atam Əlinin (ə) yolunu bərpa etmək üçün qiyam etdim."

"Ey, Əbu Süfyan övladına uyanlar! Dininiz yoxdursa və axirətdən qorxmursunuzsa, heç olmasa dünyada azad insanlar olun!"

"Bir dəstə insan behiştə görə Allaha ibadət edirlər – bunlar tacirlərdirlər. Bir dəstə də qorxularından (cəhənnəm qorxusundan) Allaha ibadət edirlər – bunlar da quldurlar. Bir qrup isə Allaha Onun verdiyi nemətlərə və Onun əzəmətinə görə və həmçinin Ona pərəstiş, sitayiş və şükür etmək üçün ibadət edirlər – bunlar isə azad insanlardırlar. Belə bir ibadət – ən yaxşı ibadətdir."

"Bilin ki, insanların sizə olan ehtiyacları – Allahın sizə verdiyi nemətlərindən biridir. Allahın nemətlərindən üz döndərməyin, yoxsa, sonra o nemətlər sizə müsibət olar."

**İmam Hüseyn (ə) Kərbəlanı özü belə tanıdır**

Təbərrük üçün İmam Hüseynin (ə) müsibətinin bir neçə məqamına da diqqət yetirmək yerinə düşər. Seyyid ibni Tavus nəql edir: "Əba Əbdillah (ə) çatanda soruşdu ki, bu yerin adı nədir? Kərbəla adını eşidən zaman buyurdu: "Bu yer bizim yerə endiyimiz və bizim qanımızın yeri və qəbirlərimizin yeridir. Bu xəbəri cəddim Rəsulallah (s) bizə vermişdir. Bura çətinlik və bəla yeridir. Bura miniklərimizi oturtduğumuz bir yerdir. Karvanlarımızın yükünü saldığımız yerdir. Kişilərimizin qətligahı, qanlarının tökülən yeridir. Bura – Kərbəladır. Bura bir yerdir ki, burada Aşura günü bir səhnələr yaşanacaq ki, insan, bəşərriyyət o səhnələri hər zaman dərk edəndə dəhşətə gələcək, heyrətlənəcək."

Aşuranı dərk etmək üçün dünyada qəbul olunmuş müvəqqəti dəyərlərə söykənən məntiqlər yetərli olmur. Bu

dəyərlərlə Aşuranın niyə baş verdiyini anlamaq olmur. Müvəqqəti, ötəri dəyərlərə söykənən nəsnələrlə Əli Əsğərin (r.ə), Əli Əkbərin (r.ə), Həzrət Zeynəbin (s.ə) Aşurada nə kimi rolunun olduğunu anlaya bilmək olmur. Bu dəyərlərlə Əba Əbdillahın (ə) öz ailəsi ilə birlikdə Mədinədən çıxıb Kufəyə yola düşməsini, oradan Kərbəlaya getməsini, burada şəhid olmasını anlamaq olmur. Bu gün dünyanın naqis dəyərlər sistemində bəndəlik, Allahın razılığı anlayışları tükənib. Bəndəlik anlayışı olmayan yerdə Kərbəla, .Aşura günü baş verənlər anlaşıla bilməz

**Yalnız Allah bəndələrinin dərk edə biləcəyi bir müsibət**

Əba Əbdillah (ə)" ifadəsinin mənası çox zaman bəziləri tərəfindən anlaşılmır. Alimlər" deyir ki, bu heç də "hansısa Abdullah adında olan bir insanın atası" mənasında deyil. Burada söhbət bir keyfiyyət daşıyıcılığından gedir. Əba Əbdillah (ə) - yəni "Allah bəndəsinin atası". Allaha bəndəlik məktəbi var. İmam Hüseyn (ə) Allah bəndələrin atasıdır. Bu Allah bəndəliyi məktəbinin şagirdlərinin atası İmam Hüseyndir (ə). İmam Hüseyn (ə) – bəndəliyin ən yüksək nümunəsidir. Necə ki, uşaq öz tərbiyəsini düzəltmək üçün atasına baxar, elə də Allaha bəndə olmaq istəyən vücudi atası olan İmam Hüseynə (ə) baxar. Bəndəlik məktəbinin körpələri, uşaqları, şagirdləri Kərbəla məktəbinə baxaraq, bəndəliyi öyrənir. Kərbəla – başdan-başa bəndəlik məktəbidir. Burada hər bir şey bəndəlik anlayışı olan zaman anlaşılır. O zaman biz Əba Əbdillahın (ə) niyə Kufəyə getməsini, oradan niyə Kərbəlaya gəlməsini, ən yaxınlarını, ailəsini özü

ilə gətirməsini anlayırıq. Anlamaq olur ki, necə özü susuz olduğu bir vaxtda düşmən .qoşununun əsgərinə su içizdirir

Həzrət Əbəlfəzli (ə) də anlamaq üçün bəndəlik məktəbinin şagirdi olmaq lazımdır. Özü susuz olan halda sudan içməyən böyük şəxsiyyətin bu davranışını dərk etmək üçün bəndə olmaq gərəkdir. Hürrü anlamaq üçün bəndəlik yolunu getmək lazımdır. Maddi səadətə çatmağın bir astanalığında Hürr anlayır ki, mənəvi zəlalətə yuvarlanır. Hürr bəndəlik və Allahın razılığı baxımından anlayır ki, hansı səhvləri edib. Əba Əbdillahın (ə) .yanına gəlir və tövbə edir. Hürr gerçək peşmançılığın dərsini bizə keçir

Bu ongünlük həm də gerçək tövbələr zamanıdır. İçərimizdə olan yezidə (lən) nə qədər qələbə çalmağa imkan vermişik? İndi daxilən paklanmaq, qəsavətlərimizi yumaq .zamanıdır. Bu məktəbin şagirdləri əsl eşqi anlayar

**Hər mənada dərs götürülməli səhnələr**

Aşuranın zöhründən sonra baş verənləri yalnız Alllah bəndəlik məktəbinin, eşq məktəbinin şagirdləri anlayar. Allah bəndəsi vücudən Əba Əbdillahın (ə) tikə-tikə doğranmış bədəninə nəzər salanda, onun yanağından öpən Həzrət Rəsulallahı (s) yada salar. İndi həmin yanaqlar doğranıb, Peyğəmbərin (s) öpdüyü boğaz kəsilib. .Rəsulallahın (s) gül balası olan Hüseyni (ə) ən şiddətli zülm ilə qətlə yetiriblər

Əslində insanın İslamın mahiyyətini dərk etmək üçün baxmalı olduğu səhnələrdir. İnsan baxmalıdır ki, özü həyatında eyni səhvləri təkrarlamasın. Baxmalıyıq ki, içərimizdə hər gün gedən savaşda mənəvi tutumumuzun qalib gəlməsinə imkan yaradaq. Çünki, İmam Hüseyni (ə) Kərbəlada qətlə yetirənlər, bir zaman öz daxilində .olan yezidlərin (lən) qalib gəlməsinə imkan verənlər idi

Həzrət Hüseyni (ə) tanımaq və sevmək kimi bir ləyaqət üçün zəmin olmalıdır insanın qəlbində. Bütün çətinliklərdə gözəlliyi görmə dərsinin ustadı – Həzrət Zeynəbi (s.ə) .tanımaq üçün zəmin olmalıdır insanın qəlbində. Bu zəmin Allahın tofiqatına bağlıdır

!Salam olsun sənə, Hüseyn can

!Salam olsun sənə, ey aşiqlərin və azadələrin mənəvi qibləsi

!Salam olsun sənə, ey ləyaqət və izzəti-nəfsin kamil daşıyıcısı, Əba Əbdillah

Salam olsun sənə, ey Məhərrəm ayı. Sevgini və nifrəti öyrədən ay. Gözəlliklərlə .dostluğu və eybəcərliklərlə düşmənçiliyi öyrədən ay

.Salam olsun sənə, ey məhərrəm-səfər əyyamının ilk ongünlüyü

Ariflərin bu ongünlüklə bağlı xüsusi tövsiyələri var. Sanki bu ongünlükdə Allah Təalaya, Onun Rəsuluna (ə) sevginin, vəfadarlığın və imanın xüsusi yaşadılması üçün bir fürsət mövcuddur. Sanki baş vermiş vücudi bir faciəyə görə iradəvi kədərin yaşadılması üçün .bir təbərrük imkan var

Kamil arif və əxlaq ustadları məhərrəm-səfər əyyamının ilk ongünlüyü ilə bağlı :tövsiyələri bu incə mətləbləri bizə çatdırır. Ariflər bildirirlər ki

Bu ongünlükdə) məqsəduyğundur ki, Əhli-beyt (ə) dostlarının halı dəyişə, qəlblərində)“ və üzlərində bu böyük və ağrılı müsibətin qəminin və ağrısının əlamətləri görsənə. .Allaha və Rəsuluna (s) sevgi, vəfadarlıq və iman buna hökm edir

O cümlədən) Gərək yemək, içmək, hətta yatmaq, söhbət etmək kimi həyat) ləzzətlərindən də bir miqdar tərk

etmək (zərurət həddində istisna olmaqla) və o kəs kimi olmaq ki, atasını və ya övladını .itirib

Məbada Allahın namusunun ehtiramı, Peyğəmbərin (s) ehtiramı və İmamının (ə) ehtiramı özünün və yaxınlarının ehtiramından az ola. Və lazımdır ki, Allah Təalanı, .”Peyğəmbəri (ə) və İmamını (ə) özündən, övladından və yaxınlarından daha çox istəyə

**...Məhərrəm – bir aydır ki**

İmam Rzadan (ə) məhərrəm ayı ilə bağlı belə bir hədis nəql edirlər: “Məhərrəm - bir aydır ki, cahiliyyət əhli bu ayda müharibə etməyi haram hesab edərdi. Amma bizim qanımızı o ayda halal saydılar. Bizim hörmətimizi o ayda qorumadılar. Övlad-əyalımızı əsir götürdülər. Xeymələrimizi oda çəkdilər, orada hər nəyimiz var idi, qarət etdilər və .”Rəsulun (s) hörmətini bizim barəmizdə riayət etmədilər

Hədisin təhlilində ilk öncə fabulasını, məzmununu təşkil edən «cahiliyyət dövrü» məfhumuna toxunaq. Bu anlayış Ərəbistan yarımadasında İslamdan öncəki perioda, Həzrət Rəsulullahın (s) İlahi risaləti təbliğ etməyə başlamasından öncəki perioda şamil edilir. Cahiliyyət dövrü dedikdə, müasir mənada işlənən «bisavadlıq» nəzərdə tutulmur. Ərəblərin İslamdan öncə də şifahi ədəbiyyatı çox inkaşaf etmişdi. Burada «cahiliyyət» - İlahi təlimdən məlumatsızlıq mənasında işlənir. Həzrət İmam Rzanın (ə) bu dövrə .işarəsi təsadüfi deyil, bu məsələnin sonradan açılışı veriləcəkdir

Hədisdə istinad edilən digər müstəvi - İslam Peyğəmbərinin (s) Əhli-beytinə (ə) ehtiram barədə İlahi göstərişdir. Belə ki, Qurani-Kərimin “Şura” surəsinin ٢٣-cü :ayəsində Allah Təala buyurur: “(Ya Peyğəmbər!) De

Mən Sizdən bunun (risaləti təbliğ etməyimin) müqabilində yaxınlarıma (Əhli-beytimə)“ sevgidən başqa bir şey istəmirəm”. Müqəddəs Kitabda Həzrət Peyğəmbərin (s) Əhli-beytinə məhəbbət və ehtiram barədə açıq-aydın göstərişə rəğmən, Yezid lənətliyin qoşunu İmam Hüseyni (ə) və əziz məsləkdaşlarını qanlarına qəltan etdilər. Beləliklə, mübarək hədisdə məsələ ۲ müstəvidə qoyulur: əgər siz müsəlmansızsa, onda digər müsəlmanın qanı və malı toxunulmazdır, ehtiram ünvanıdır. Peyğəmbərimizin Əhli-beytinə (ə) bilavasitə aid olan İmam Hüseynə (ə) aid isə nəinki toxunulmazlıq, hətta məhəbbət göstərmək göstərişi də vardır. Yəni, əgər müsəlmansınızsa, sizin borcunuz idi İmama (ə) qeyd-şərtsiz ehtiram etmək, nəinki onu mühasirəyə alıb, olmazın məşəqqətlərə məruz qoyub, əzizləri ilə birgə şəhadətə yetirmək. Beləliklə, Yezid lənətliyin ordusuna toplaşmış canilər müsəlman olmaq iddiasında olan adamlar idi, amma Rəsullulahın (s), Mütəal Allahın göstərişlərinə qarşı üsyan etdilər, İmamı (ə) qətlə yetirdilər. Bu azmış kimi, Peyğəmbərimizin (s) Əhli beytinə aid mübarək şəxsləri .əsir götürdülər, əmlakını qarət etdilər

## Cahiliyyət dövrünün adətinə də əməl etmədilər

Qeyd edək ki, cahiliyyət dövrünə işarə mübarək hədisin məzmununu digər rakursdan açır: yox, əgər müsəlmanlığı danıb, cahil ata-babalarınızın yolu ilə gedirsinimzsə, bu halda, cahiliyyə dövrünün ərəbləri kimi olaydınız heç olmasa. Cahiliyyə dövrünün ərəbləri məhərrəm ayında müharibə etməyi haram bilərdilər. Bu - tabu, yasaq edilmiş bir məsələ idi, hətta cahiliyyə dövrünün ərəbləri də bu mövzuya ciddi riayət edirdi. Demək, Yezid

lənətliyin ordusu bu müddəaya da belə, əməl etmədi, cahil ata-babalarının adətini də .tapdaladı

Mahiyyətinə varanda, bununla Yezid lənətliyin ordusunun hər hansı bir əxlaq, mənəviyyat, insani dəyərlər sisteminin xaricində olması vurğulanır. Yəni, adam cildində olan bu qaniçən məxluqları heç bir dəyərlər sisteminə görə, hətta cahiliiyət dövrünün adət-ənənəsinə gərə də insan adlandırmaq mümkün olmadığı bir daha .təsdiqlənir

Mövzunu davam etdirərək, İmam Hüseynin (ə) Kərbəla ilə, o məkanla bağlı buyurduğu bir hədisə işarə edək. İmam Hüseyn (ə) buyurub: "Bura - çətinlik və bəla yeridir. Bura - miniklərimizi oturtduğumuz bir yerdir, karvanlarımızın yükünü saldığımız yerdir. ."Kişilərimizin qətlgahı, qanlarının tökülən yeridir

Hədisdə Kərbəla məkanı ilə bağlı açıqlama təqdim edilir. Kərbəla - bir imtahan məqamı, Allah yolunda ən qiymətli dəyərləri qurban vermə, şəhadətə yetişmək məkanı kimi vəsf edilir. Əslində İmam Hüseyn (ə) Kərbəlaya yetişəndə söylədiyi bu mübarək kəlamlarla İlahi seçimini bildirir, zülm və istibdada qarşı hər hansı bir güzəştin mümkünsüzlüyünü bəyan edir. Əziz silahdaşlarının da artıq seçim etdiyi, canlarını Mütəal Allah yolunda fəda etməyə hazır olduqları bilinir. Gözəl bəlağətlə ən ağır imtahanlara, əzizlərin əsir düşməsinə belə hazırlıq bildirilir, bu ağlasığmaz çətinliklərdən fərəh və sevinc duyğuları keçirildiyi bildirilir. Düşünən insan üçün nə !qədər ibrət, nə qədər dərslər var burada

### Şəhid – behiştə birinci daxil olandır

Məhərrəm-səfər əyyamının mahiyyətində olan əsas mətləbə - şəhidlik mövzusuna toxunaraq, Məsumlardan (ə) bununla bağlı bəzi hədislərə işarə edək. Həzrət

."Peyğəmbərdən (s) belə nəql edirlər: "Behiştə birinci daxil olan kəs - şəhiddir

Görürük ki, burada şəhidliyin yüksək məqamı göstərilir. Şəhidliyin Allah dərgahında olan mərtəbəsi göstərilir. İlahi mükafata ilk layiq görülən şəxs, İlahi rəhmətə ilk qovuşan şəxs - şəhiddir. Behişt – müsbətliklərin təcəssümüdür. Bu məkana ilk daxil .olan insan – misilsiz müsbətlik sahibidir

Bu mövzuda İmam Səccaddan (ə) belə bir hədis nəql edilir: "Allah dərgahında heç bir qətrə ٢ qətrədən daha sevimli deyil: (birincisi) Allah yolunda tökülmüş qanın qətrəsi; ."(ikincisi) gecə qaranlığında axıdılan göz yaşının qətrəsi

Hədisdə toxunulan məqamları açıqlamaq istəsək, qeyd etməliyik ki, mübarək mətndə qeyd edilən hər iki mövzu bir bulaqdan qaynayır - Allaha olan eşqdən, həqiqi bəndəçilik arzusundan. Diqqət etsək, hədisdə «gecə qaranlığı» məfhumu işlədilir. Bu - ixlasa, səmimiyyətə, qəlbin riqqətinə işarədəir. Gözlərdən dalda bir məkanda bəndə Rəbbi ilə raz-niyaz edir, günahlarından tövbə edir, səhv və xətalarından Allaha pənah aparır. Təsadüfi deyil ki, şəhidin qanı bu göz yaşı ilə bərabər tutulub. Hər ikisinin mayası eynidir - ixlas, xalis niyyət. Yer üzərində öz yüksək missiyasını anlamaq və bu .ideallar uğrunda hər bir şeyi qurban verməyə hazır olmaq

Digər bir hədisdə Həzrət Peyğəmbərdən (s) belə nəql edirlər: "Şəhidin ilk qan qətrəsinə ."Allah Təala ۶ savab əta edər ki, (bunların birincisi odur ki,) bütün günahları məhv olur

Bəli, məlum olur ki, Mütəal Allah şəhadət məqamına çatan əziz bəndəsini əfv edir. Onun günahları silinir, heç bir şey olmamış kimi, əməl kitabı tərtəmiz olur. Səbəb - aydındır

bəndə imtahanını şərəflə verdi. Seçim qarşısında durduqda, geri çəkilmədi, başqasının arxasında gizlənmədi. Canını fəda etdi. Və əlbəttə ki, ən başlıcası – burada niyyət məsələsidir. Əməllər yalnız Allaha bağlandıqda bunun mənası və müvafiq nəticəsi olur. .Yalnız həqiqi Əbədiyə bağlı olan əbədi qalar və tarixin girdablarında itməz

Şəhidə xas yüksək məqama aid İmam Cəfər Sadiqdən (ə) belə bir hədis nəql edilir: “Heç bir şəhid yoxdur ki, İmam Hüseynlə (ə) birgə olmaq istəməsin. Və onlar İmam .”Hüseynlə (ə) birgə behiştə daxil olacaqlar

Burada Şəhidlər Sərvəri (ə) ilə birgə olmağın fəlsəfəsinə bir qədər toxunaq. Şəhadətə səbəb olan amil – Allahın razılığını əldə etmək, İlahi vəzifəni yerinə yetirmək arzusudur. Və bu niyyətin zirvəsi – İmam Hüseyndir (ə). Demək bütün şəhidlərin bu arzuda olması .mübarək bir arzudur və Mərhəmətli Allah bu arzunu, inşəallah, gerçəkləşdirəcəkdir

Şəhadətə xas məqamlara toxunaraq, Həzrət Peyğəmbərdən (s) bir hədis nəql edək: .”“Ən üstün şəhidlər o kəslərdir ki, birinci xətdə şəhid olurlar

Mübarizənin önündə gedən insanlar, topluma dinamika verən, cəmiyyəti manqurtlaşmaqdan, laqeydlikdən xilas edənlər – İlahi dərgahda əziz tutulanlardır. Bunlardır topluma dirilik verən, məhvdən xilas edən. Və, təbii ki, ilk öncə həyatlarını da qurban verənlər onlardır. Və öncüllükləri səbəbindən də ən əziz tutulurlar. Bizim Mübariz İbrahimov belələrindən idi. Allah ona da, Vətən uğrunda, inanc uğrunda canını .fəda edən bütün şəhidlərə də İmam Hüseynlə (ə) birgə olmaq tofiqatını nazil etsin

## Aşura hərəkatının əsl hədəfi – islahdır

İmam Hüseynin (ə) bu nurani hərəkatında, bu nurani təlimində, məktəbində öyrənilməli, ibrət götürülməli çoxlu məsələlər var. O hərəkatın, o məktəbin, o təlimin hədəfi doğru-dürüst öyrənilərsə, o zaman daha dərin dərslər və ibrətlər götürmək olar. İmam Hüseynin (ə) Kərbəla məktəbinin ən böyük hədəfi, ən əsas hədəfi - İslam toplumunu düz xəttə qaytarmaq idi. Peyğəmbərdən (s) sonra yolunu azmış, yolunu azmağa hazır olan bir toplumu düz xəttə, Rəsullullahın (s) gətirdiyi İslama qaytarmaq, sapmalardan, əyrintilərdən, mahiyyətcə cövhəri dəyişiliklərdən yenidən öz məcrasına qaytarmaq hədəfi var idi. Kərbəla hərəkatının ən böyük hədəfi budur. Bunun üçün edilən bütün işlər – vasitədir. İmam Hüseynin (ə) hədəfi budur. İmamın (ə) öz buyuruşları ilə desək, Aşura hərəkatının əsl hədəfi - islahdır. Müsəlman toplumunun islahıdır. Əsl hədəf - "əmr-be-məruf" və "nəhy-əz-munkər"dir (yaxşılıqlara dəvət və pisliklərdən çəkindirmə). Aşura məktəbinin ana hədəfi yaxşılıqlara dəvət və pisliklərdən çəkindirmədir. Düz yolla gedənləri pisliklərdən xəbərdar edib, onların sapmamasına kömək etmək və düz yoldan, düz istiqamətdən, məcrasından çıxmışları, ifrata və təfritə gedənləri yenidən düz istiqamətə qaytarmaqdır. Kərbəla yaxşılıqlara, gözəlliklərə, Rəsulullahın (s) gətirdiyi ilahi təlimə dəvətdir və bu təlimdən xaric olan hər bir şeydən çəkindirmədir. Çünki artıq Rəsulullahın (s) gətirdiyi dinin mahiyyətinin, cövhərinin dəyişmək təhlükəsi var idi. Bu yerdə İmam Hüseyn (ə) öz nurani qədəmləri .ilə bu yolda olacaq hər bir hadisəni göz önünə alaraq, meydana girir

## ?İmam Hüseyn (ə) üçün nədir hədəf

İmam Hüseyn (ə) üçün nə hakimiyyətə gəlmək hədəfdir, nə də şəhadətə yetmək. Hakimiyyət də, hətta

şəhadətə yetişmək də vasitədir. İmam Hüseynin (ə) hədəfi – toplumun islahıdır. İnsanların öz mahiyyətinə qayıtmasıdır, insanların İNSAN olmasıdır İmamın (ə) hədəfi. İmam Hüseynin (ə) missiyası, Allah qarşısında vəzifəsi, üzərinə düşən İlahi təklif – İslamın yenidən dirildilməsidir, əhyasıdır, yenidən həyata qaytarılmasıdır. Bu yolda bütün baş verənlər təfərrüatdır, haşiyədir, vasitədir, lakin hədəf deyil. Hədəf budur ki, toplum özünə tərəf qayıtsın, yenidən diriliyə tərəf gəlsin, qaranlıqdan işığa tərəf gəlsin. Toplum sapmalara tərəf deyil, əyrintilərə tərəf deyil, İslamın ana xəttinə – "Siratəl-mustəqim"ə qayıtsın.

**"Allaha xatir Rəsulullahın (s) hərəmini müdafiə...**

"Allaha xatir Rəsulullahın (s) hərəmini müdafiə etməyə bir kömək edən varmı?"

Kərbəla səhnəsinə gedək. Əba Əbdillah (ə) özünün bütün səhabələrini şəhid verib, Əhli-beytindən olan insanları şəhid verib. Tək-tənhadır. Minlərlə lənəlitlik yezidlərin içində fəryad çəkir: "Allaha xatir Rəsulullahın (ə) hərəmini müdafiə etməyə bir kömək edən varmı?!". Bu müsibəti zikr edərkən, adamın ürəyini titrədən səhnələrdən hansını yada salsaq, ürək sızıldayır...

Xeymədən çıxıb əmisinin tənhalığını görən İmam Həsənin (ə) oğlu Abdullahın özünü ona tərəf çatdırmaq istədikdə, Həzrət Zeynəbin (ə) halınımı yada salaq?! Adam dəhşətə gəlir bu səhnədən. Aşura gününün səhərindən bütün müsibətləri görən Həzrət Zeynəb (ə), indi də görür ki, yetim qardaşı oğlu ona deyir: "Bibican! Xeyr! And olsun Allaha, qoymaram əmim İmam Hüseyn (ə) meydanda tənha qala!". Az keçmir, əmisinin yanında dayanan bu qəhrəman bala, görür ki, İmamın (ə) üzərinə qılıncla zərbə endirirlər. Əlini qaldırır İmamı (ə) müdafiə etmək üçün. Amma kəsici qılıncın zərbəsindən əli bədənindən ayrılır, bir dəri ilə

.birləşmiş qalır. Abdullahın, “Atacan!!!...” fəryadı Kərbəlanı silkələyir

Amma müsibət hələ qabaqdaymış. Əmisinin qucağında Abdullah balanın qurbanlıq səhnəsi hələ qabağdaymış. Yezidilərdən lənətlik Hərmələ nişan alır Abdullahın nazik boğazını və onu qətlə yetirir. Yəqinən nənəmiz Zəhra (ə) bu səhnələri görüb “Vay-vay ...balam, vay-vay!” deyir. Yəqinən bu günlərdə nənəmiz Zəhra (ə) matəm saxlayır

Amma müsibətin ən ağrılı yeri bundadır ki, Əba Əbdillah (ə) hər şəhidin mübarək bədəninin yanına gedərdi. Amma Həzrət İmam Hüseyn (ə) özü sonda şəhadətə yetəndə, tək-tənha, yalqız halda, düşmənlərinin əhatəsində qalmışdı. Tikə-tikə parçalanmış Hüseyn can, Rəsulullahın (ə) mübarək öpüşləri ilə nəvaziş olunmuş balanın param-param olmuş çöhrəsi... Lə həvlə və lə quvvətə illə billəh – Yoxdur ...Allahdan başqa güc və qüdrət

**?Necə oldu ki, Aşura baş verdi**

Aşura gününün ən önəmli mövzularından biri budur ki, insan gərək Aşuranın niyə baş verməsi barədə düşünsün. Necə oldu ki, Aşura baş verdi? Peyğəmbərimizin (s) vəfatından az bir vaxtdan sonra, ümmət necə olur ki, Peyğəmbərin (s) özündən bildiyi, onun haqqında ən ali sözlər söylədiyi bir şəxsi qətlə yetirmək halına gəlir? Dəyərli mütəfəkkirlərin nəzərində, bu hadisənin baş verməsinin ən ciddi və əsas səbəbi budur ki, toplumda fəal şeytanlarla lal şeytanlar ittifaqa girmişdilər. Lal şeytanların fəal şeytanlarla ittifaqı nəticəsində Aşura baş vermişdi. Fəal şeytanların kim olduğu bəllidir. Misal üçün, günümüzün fəal

şeytanları bu adamlardır ki, onlar İslamın atributlarının aradan getməsi üçün canfəşanlıq edərlər. Heç bunlardan o qədər də tələb olunmaz, onlar özləri bu məsələlərdə fəallıq göstərərlər. Fəal şeytanlar birdən-birə gəlib fəal şeytan olmur. Öncə bir qarınlıq zülm edir. Zülm edir ki, bir qarınlıq çörəyini təmin etsin. Sonra dünyanın cəzzabiyyəti onu özünə tərəf dartır. Qanına haram daxil olandan sonra, hansı zülm istənilirsə, onu da edir. Fəal şeytanların sayı çox az olar. Amma, bu fəal şeytanların öz işlərini görməyə imkan verənlər - lal şeytanlardır. Fəal şeytanların fəaliyyət göstərməsi üçün münbit şərait yaradan böyük sayda lal şeytanlar olur. Lal şeytanlar kimlərdir? Lal şeytanlar onlardır ki, onların heç qəlblərində də fəal şeytanların işlərinə etiraz yoxdur. İnsanın gərək heç olmasa qəlbində bir etirazı ola, bir .narahatçılıq keçirə

Aşura da məhz buna görə baş verib. Bir hissə var idi ki, onlardan biri əmr verirdi, biri icra edirdi, biri suyun qarşısını kəsirdi, biri mühasirəyə almışdı, biri çalışırdı ki, Əba Əbdillahın (ə) mübarək vücuduna zərbələr endirə. Aydındır ki, bunlar fəal şeytanlar (lən) idi. Amma, bir hissə də var idi ki, bütün bu hadisələr onların gözləri qarşısında baş verirdi. Bunlar lal şeytanlar idi. Bütün bu fəal şeytanların (lən) bir yaxını var. Gərək onlar həmin kəsləri bu pis işdən çəkindirəydi. Gərək, bu fəal şeytanların (lən) ailəsi onlara etiraz edərdi, haramla onları dolandırmasına əks mövqeyini bildirəydi. Yəni, lal şeytanların edə biləcəkləri işlər çox olur, lakin, onlar sükut edirlər. Lal şeytanların da ,niyə sükut etməsi aydındır. Birinin bir keçəcəyi var

digərinin bir başqa məsələsi. Elə buna görə də, Kərbəlada baş verən müsibətin .kökündə də elə həmin məsələ durur

### Aşuradan gənclərin götürəcəyi ən mühüm dərs

Aşura səhnələrinə diqqət etdikdə gənc nəsil üçün, yeniyetmələr üçün çox önəmli bir məqam ortalığa çıxır. Təhlilçilər qeyd edirlər ki, Aşuranın bütün səhnələrində şücaət məqamı var. Aşura qəhrəmanı olaraq, İmam Hüseyn (ə) - bir şücaət nümunəsidir. Amma, bu şücaət lazımsız yerə, necə gəldi sərf edilmir. İmamın (ə) ən zəruri xüsusiyyətlərindən biri – tədbirlilikdir. İmam Hüseyn (ə) Aşuranın bütün səhnələrində tədbirlilikə davranır. Şücaətin istifadə olunmasında başdan-başa tədbirlilik var. Aşura məktəbinin yetirməsi, bu məktəbdən dərslər çıxaran insan gərək özündə bu .xüsusiyyəti yaşada bilsin. Hər bir şücaətin yanında bir tədbirlilik də olmalıdır

Əgər Aşuranın çatdırmaq istədiyi həqiqəti qısa şəkildə, sadə formada ayırd etmək istəsək, o, bundan ibarətdir: heç bir vəziyyətdə, heç bir halda, heç bir şəraitdə izzətinizi əldən verməyiniz! Bunun üçün şəhadətə qədər getmək lazım olsa belə, izzəti əldən .vermək olmaz. İmam Hüseyn (ə) bizə çatdırır ki, heç bir halda izzəti əldən verməyiniz

### Aşura günü şeytanların (lən) işi

Dəyərli ürəfalardan biri çox gözəl buyurur: "Bu işin Aşurası da geridə qaldı. Amma, bu əyyamın qədrini gerçəkdə o kəslər bilər ki, keçən il var idilər və Aşuranı dərk

etmişdilər, amma indi aramızda yoxdurlar, dünyalarını dəyişiblər. İndi axirət aləmindədirlər. Və bu feyzi bir daha dərk etmək imkanı əllərində yoxdur. Onlar artıq bilirlər ki, insanların əlində nə boyda böyük və əzəmətli bir nemət var imiş. Təəssüf edərlər ki, indi artıq o nemət ixtiyarlarında deyil". Bu məsələdə diqqətli olmaq lazımdır. Bizlər bu boyda nemətə malikik. Allah bizə lütf edib, bir balaca Hüseyni (ə) çağırışla qəlblərimizdə silkələnmə olur və Hüseyn (ə) məclisinə gedirik. Nə böyük nemət! Və haradan bilirik? Bəlkə bizim də sonuncu Məhərrrəm-Səfər əyyamımızdır. İndidən bu .nemətə sahib çıxmaq lazımdır ki, sonradan eyni təəssüfü keçirmiş olmayaq

İslam Peyğəmbəri (s) buyurur: "İmam Hüseynin (ə) şəhadət günü şeytanların ən böyüyü (lən) digər şeytanlara (lən) söyləyir: "Aşura vaqiəsi haqqında insanlara şəkk-."" şübhə və tərəddüd yaratmaq üçün insanların arasına gediniz

Bizlər də günümüzdə bunların şahidiyik. Aşura ərəfəsində insanlar hay-küy salarlar, şəklər yaradırlar. Ya bunlar həmin şeytanların (lən) özləridir, ya da həmin şeytanların .vəsvəsəsinə uyanlardır. İki haldan kənar deyil

....Zəlalətin ardıcılları Hüseyn (ə) nişanələrini aradan aparmaq üçün hər şey edəcək

İslam Peyğəmbərinin bununla bağlı daha bir çox mübarək buyuruşu var. İslam Peyğəmbəri (s) buyurur: "Küfrün öndərləri, rəhbərləri və zəlalətin ardıcılları İmam Hüseynin (ə) nişanələrini məhv edib səh:۵۸

aradan aparmaqda çox çalışacaqlar. Lakin, bu təlaşlar və səylər yalnız bir nəticə verəcək – (bunun müqabilində) onun (İmam Hüseynin (ə)) təzahürləri daha da çox üzə .”çıxacaq. Və onun məsələləri daha da ucalacaq

Həzrət Peyğəmbər bizi xəbərdar edir ki, küfrün rəhbərləri, zülmün, zəlalətin ardıcılları əllərindən gələn hər bir şeyi edəcək ki, İmam Hüseynin (ə) nişanələrini, onun təzahürlərini, Əba Əbdillahın (ə) mədəniyyətinə aid olan hər bir məsələni aradan aparsın. Elə günümüzdə də görürük ki, çalışırlar. Bu xəbərdarlıq zamanımızda xüsusilə parlayır, özünü göstərir. Peyğəmbərimiz (s) bizləri həm də müjdələyir. Xəbərdarlıqda deyilir ki, zəlalətin ardıcılları hər şey edərlər. Amma nəticə bir olacaq. Nəticə budur ki, bütün dünya Hüseyndən (ə) danışır. Tək Kərbəla deyil, tək Nəcəf deyil, tək Bakı deyil, tək Əhli-beyt (ə) sevən məmləkətlər deyil, bütün dünyada “Hüseyn-Hüseyn!” (ə) şüarları ucalır. Nə qədər bu məsələnin üstünə gedilir, daha da Hüseyn (ə) tanıyanların sayı artır. Əziz İslam Peyğəmbəri (s) bizləri məlumatlandırır ki, narahatlığımız olmasın, .öz üzərimizə düşən işlərimizi görək

### ?Əba Əbdillahın (ə) şəhadətinin özəlliyi nədədir

Alimlərin təbərrük buyuruşlarında qeyd olunur ki, İmam Hüseynin (ə) şəhadətinin çox sayda özəlliyi var. Dünyada çox qəhrəmanlıqlar olub. Qədim dövrdən bu yana çox-çox qəhrəmanlıq göstərən insanlar olub. Əba Əbdillah (ə) çoxlarından fərqli olaraq, adını tarixdə saxlamaq üçün

deyil, Allaha bəndə olmaq üçün qəhrəmanlıq edib. Aşurada hər şey Allah üçündür. Bir önəmli nöqtə də var. Tarixdə çox övliyalar olub ki, onlara işgəncələr verərək öldürülüblər. Peyğəmbərlər (ə) olub ki, əziyyətə məruz qalıblar, çətinliklərlə rastlaşıblar, başlarına müsibətlər gətirilib. Əba Əbdillaha (ə) qədər də, ondan sonra da elə insanlar olub ki, Allaha xatir zülmə məruz qalıblar. İslam çox sayda qəhrəmanlar yetişdirib. Amma, Əba Əbdillahın (ə) məktəbində yeganə çalar bu deyil ki, Allahın sevdiyi bir bəndəyə əziyyət verirlər, onu şəhid edirlər. Burada insanların anlaya biləcəyindən daha üstün bir məsələ var. Məsumlardan (ə) buyurulur: "Sizin bunu dərk etmək taqətiniz yoxdur! Bir ləhzəni ki, Həzrət Seyyidüş-Şühədanın (ə) müqəddəs ruhu bədənindən ayrıldı və yuxarı tərəfə ucaldı. Hər asimana ki, çatdı, o asimanın mələkləri Həzrətin (ə) ruhunu gördülər, o səhnəni görməkdən bir-bir vücudları lərzəyə gəldi. Və .”bu lərzəyə gəlmə və titrəmənin Qiyamət gününə qədər davamiyyəti olacaq

Bu, bizim anlaya biləcəyimiz məsələ deyil. Məsumlar (ə) bizə çatdırır ki, Kərbəla vaqiəsi - bütün varlıq aləmində baş verən faciədir. Bu, vücudi aləmdə baş verən qlobal faciədir. Yəni, Aşura yalnız insanları narahat edən fraqmental bir səhnə deyil. Bütün .varlıq aləmi Əba Əbdillahın (ə) şəhadətindən narahat olur

## Əli Əkbərin hikmətli davranışının fəlsəfəsi

Aşura səhnəsinin hər guşəsi bir nurani çalardır. Qəlbləri yandıran çox sayda səhnələr var burada. Qəlbləri yandıran nurani səhnələrdən biri də Əli Əkbər ağanın səhnəsidir. Bu səhnəni müxtəlif baxışlardan, müxtəlif yönlərdən hamı eşidib. Burada hər şey var. Əli Əkbər ağanın Peyğəmbərə (s) ən çox oxşaması məqamı var: insanlar Peyğəmbəri (s) xatırlamaq istəyən zaman Əli Əkbər ağaya nəzər salardılar. Bu da var ki, Əli Əkbər ağanın ana tərəfdən babası - Həzrət İsaya (ə) ən çox oxşayan şəxsdir. O səhnə də var ki, İmam Hüseynin (ə) bacısı Həzrət Zeynəb öz balaları şəhid olanda səbir edər, Əli Əkbər ağa şəhid olanda isə meydana çıxar, özünü atar Əli Əkbər ağanın mübarək şəhid bədəninin üstünə. Əli Əkbər ağa o kəslərdəndir ki, İmam Hüseyn (ə) onu özü xeymələrə gətirməyib. Yəni, adətən şəhidləri İmam Hüseyn (ə) xeymələrə özü gətirərdi. Amma, Əli Əkbər ağa şəhid olanda, onu özü xeyməyə gətirmir. Burada bir .incə nöqtə var

Əli Əkbər ağa Aşura gününün ilk şəhidlərindəndir. Onun məqamı fövqəl dərəcədə yüksəkdir. Belə başa düşülür ki, on dörd Məsumdan (ə) sonra ən ali məsumiyyət məqamına çatmış insanlardandır. Elə-belə deyil ki, İmam Hüseyn (ə) Əli Əkbər ağa .şəhadətə çatan zaman lənətlik yezidlərə qat-qat daha çox nifrin deyir

Bu da bilinəndir ki, döyüş getdikcə suzuma daha çox artar. Əli Əkbər ağa Aşura səhnəsində meydana gedən və şəhadətə çatan ilk şəxslərdəndir, amma İmam Hüseyn (ə) ağaya susuzluqdan danışır. Ondan sonra çoxları şəhid olacaq. Əli Əkbər ağanın suzuması digərlərindən daha az səh:۶۱

dərəcədədir. Əcaba, burada nə hikmət var ki, bu cəngavər susuzluqdan danışır. Əli Əkbər ağa meydana çıxır, döyüşür, şəhadət öncəsi dəqiqələrdə qayıdır Əba Əbdillahın (ə) hüzuruna. Deyir: "Atacan, susuzluqdan ayaq üstə dayana bilmirəm. Və silah-sursatımın ağırlığı mənə əziyyət verir". Əcəba, bunun nə himkəti var ki, Əli Əkbər ağa !?atası ilə susuzluğundan danışır, silah-sursatının ona ağırlıq verməsindən danışır

Alimlərimizin bu hissədə çox incə təhlili var. Deyirlər ki, məsələ o deyil ki, Əli Əkbər ağa susuzdur və gəlib susuzluğunu Əba Əbdillaha (ə) çatdırmaq istəyir. Mövzu o deyil ki, Əli Əkbər ağa vəziyyətinin çətinliyini İmama (ə) çatdırmaq istəyir. Əli Əkbər ağa o adam deyil. Bəs onda məsələ nədir? Belə aydınlaşdırılır ki, Əli Əkbər ağa istəyir ki, onun şəhidlik xəbərinin gəlib İmama (ə) çatmasından onun fikrini yayındırsın. İstəyir ki, onun ağır müsibət xəbərinin Əba Əbdillaha (ə) çatması zamanı Mövlasının (ə) fikrini yayındırsın. İstəyir başqa bir məsələ ilə onun zehnini məşğul etsin. İstəyir ki, Mövlanın (ə) qəlbi o müsibəti birbaşa almağa deyil, ona azacıq qarışıq ilə almağa məşğul olsun. Müsibətin özü o qədər ağırdır ki, Əli Əkbərin məqamı o qədər böyükdür ki, İmam Hüseynin (ə) bu müsibətə tab gətirmək mövzusu ortalığa çıxır. Ona görə də İmam (ə) .atasının fikrini yayındırmağa çalışır

Təhlilçilər bir məsələni də qeyd edirlər. Yazırlar ki, Həzrət Zeynəb özünü elə-belə Əba Əbdillahın (ə) gözünün qarşısında Əli Əkbər ağanın üstünə atmır. Xanım da istəyir ki, İmam Hüseynin (ə) fikrini yayındırsın. İstəyir, Əba səh:۶۲

Əbdillahın (ə) fikrini özünə çəksin. Müsibət o qədər ağırdır ki, bəsirətli Əli Əkbər ağa kimi, Həzrət Zeynəb də İmama (ə) kömək etmək istəyir. Burada bizlər üçün ibrət və dərslər var. Yəni, bizlərə çatdırılır ki, müsibət vaxtı insanların fikirlərini bir az yayındıraq. Burada həm də valideylərin ağır yüklə yüklənməməsi məsələsi var. Allah !Təala bizlərə bu dərsləri dərk etməyi nəsib etsin, inşəallah

### Yerlərin və göylərin zinəti

Toxunacağımız mübarək cəhətlər İmam Hüseynin (ə) hidayət çırağı və nicat gəmisi olmasıdır. Bəli, Əba Əbdullah (ə) – yolgöstərən bir işıqdır. Bəli, İmam Hüseyn (ə) nicat .verən bir gəmidir. Xilasolma vasitəsidir

İmam Hüseyn (ə) buyurur: «Allahın Peyğəmbərinin (s) yanına getdim. Ubey ibn Kəb onun yanında idi. Allahın Peyğəmbəri (s) mənə dedi: “Xoş gəlmisən, ey Əba Abdullah! .”!Ey göylərin və yerlərin zinəti və bəzəyi

Ubey Peyğəmbərə dedi: «Ey Allahın Peyğəmbəri! Necə ola bilər ki, sizdən başqası .«!?göylər və yerlərin zinəti olsun

Peyğəmbər (ə) buyurdu: «Ey Ubey, məni haqq olaraq peyğəmbər göndərənə and olsun ki, Hüseyn ibn Əlinin göylərdəki məqam və dərəcəsi yerdəki məqamından daha üstündür. Allah Təalanın ərşinin sağ tərəfində yazılıb ki: (Hüseyn) hidayət çırağı və nicat gəmisi, yorulmaz, izzətli, fəxr olunmalı, yol göstərən İmam və (qiymətli) .”«azuqədir

Bəli, İmam Hüseyn (ə) mübarək vücudunun bərəkətlərindən ikisi də budur ki, o, .“hidayət çırağı” və “nicat gəmisi”dir

Bütün peyğəmbərlər (ə) hidayət çırağı olublar. Nicat üçün vasitə olublar. İmam Hüseynin (ə) xüsusi məqamı var ki, onun hidayət çırağı olmağı xüsusi vurğulanır. Ümmətin qaranlıq zülmətə büründüyü bir zamanda Əba Əbdillahın (ə) vücudu “hidayət çırağı” kimi tam nuraniyyəti ilə təzahür tapır. Düz Qiyamət gününə qədər bütün bu qaranlıqları, zülmətləri yaran bir hidayət çırağıdır İmam Hüseyn (ə). Bir yolgöstərən .işıqdır onun mübarək vücudu. Hədəfə çatdıran ən nurani vasitədir

Ümmət lənətlik Əməvi fitnələrinin içində boğulan zaman Əba Əbdillahın (ə) mübarək vücudu nicat gəmisi kimi tam xilaskarlığı ilə meydana çıxır. Qiyamətə qədər fitnələr fırtınalarında nicat gəmisidir. Keçmişdə olan fitnələrdən xilas vasitəsi olub, günümüzün ağır fitnələrindən mübarək bir nicatdır və gələcəkdə də – Qiyamətədək olacaq .(fitnələrdən – xilas vasitəsidir Əba Əbdillah (ə

Desək ki, məhərrəm-səfər əyyamı hidayəti dərk etmək və hidayət olunmaq əyyamıdır – yanlış deməmişik. Məhərrəm-səfər əyyamı fitnələr fırtınası içində boğulan .vücudların, məhv olan vücudların nicat tapması üçün bir gəmidir

**Hidayət çırağı**

Ötən bəhslərimizdə İmam Hüseynin (ə) mübarək şəxsiyyətinin ٣ cəhətinə toxunduq. Birincisi qeyd etdik ki, səh:۶۴

İmam Hüseyn (ə) – hidayət çırağıdır. O Həzrət (ə) gedilən yola işıq, nur saçan bir hidayət vasitəsidir. Qaranlıqda, zülmətdə, lənətlik iblis tör-töküntülərinin cürbəcür rənglərdə, cürbəcür hoqqalarla dünyanı qaranlığa bürüdüyü bir zamanda Əba Əbdillahın (ə) mübarək şəxsiyyəti bir hidayət çırağıdır.

Burada günümüzlə bağlı bir haşiyə çıxaq. Əgər alimlərimiz, müctəhidərimiz ki, İmam Hüseyn (ə) məktəbinin şagirdləridir – bu günün qaranlıq və zülmətləri içində bu böyüklükdə işıq saçırlar, indi gör həmin mübarək məktəbin banisinin yayımladığı nur nə dərəcədə şiddətlidir! Bu gün alimlərimiz nə etməlilərlə, necə etməlilərlə, hansı yolun uğurlu, hansının uğursuz olması ilə bağlı ümmətə dəqiq və dürüst yol göstərirlər. Əgər İmam Hüseyn (ə) məktəbinin şagirdlərinin bərəkəti bu qədərdirsə, Əba Əbdillahın (ə) özünün hidayət üçün nə böyüklükdə nur mənbəyi olması aydınlaşmağa başlayır. Və hər Hüseynçi bu işıqdan bəhrələnə bilər, bu hudayət nurundan faydalana bilər. Faydalandıqca da yaşadığı mühitə, yaşadığı topluma bu işıqdan ötürməlidir.

Kərbəla, Kərbəla... Məhərrəm-səfər əyyamı bir əyyamdır ki, bu günlərdə bu işıq xüsusi şiddətlə nur saçar. Allah Təala cəmimizə bu işıqdan bəhrələnməyi qismət etsin.

### Nicat vasitəsi

İmam Hüseyn (ə) – nicat gəmisidir. Artan xətt üzrə gedən fitnələrin burulğanında insanı xilas edən gəmidir bu.

Fitnələrin rəngi də artıb, çeşidi də artıb. Fitnələr üçün imkanlar da artıb. Fitnələr üçün vasitələr də artıb, üsullar da artıb. Fitnə üçün sürətlər, kommunikasiya imkanları artıb. Bu vəziyyətdə, bu durumda saysız-hesabsız, milyonlarla fitnəyaradıcı vasitələr hər bir şey edirlər ki, insan haqq yoldan sapsın. Fitnə burulğanında boğulsun. Bu təlatümlərdə başı gicəllənərək, məhv olsun. Və bu fitnələr içində nicat gəmisi olan İmam Hüseyn (ə) məktəbi var. İmam Hüseyn (ə) məktəbinin şagirdləri olan alimlərimiz insanların yaxşını pisdən ayırması üçün – mənəvi görmə qabiliyyətinin, eşitmə qabiliyyətinin güclənməsi üçün düzgün yola yönəldirlər. Bəsirət tutumu verirlər insanlara. Maddi bağlantılardan, müvəqqəti bağlantılardan qırılmağı, həqiqi rabitələri tanımağı öyrədirlər insanlara. Hüseynçı olmağı öyrədirlər insana. Çünki, Hüseynçi olana bu fırtınalar təsir edə bimir. Hüseynçi olana bu burulğanlar yan ala bilmir. Çünki, Əba Əbdillah (ə) nuru topluma .saçanda, lənətlik iblisin və tör-töküntülərinin işi çətinləşir

Bu nur hamının üzərinə saçır – istəyənin də, istəməyənin də, axtaranın da, axtarmayanın da. Bir mənəvi süfrə açılır məhərrəm ayı gələndə və hamıya çağırış edilir: “gəl, Hüseyni ol!”, “Gəl Hüseynləş! Gəl, dəxi dilin Hüseynləşsin, gözün Hüseynləşsin, qəlbin Hüseynləşsin!”. Dilin qeybət etməsin, zalıma məddahliq etməsin, yalan danışmasın, haqqı desin. Gözün harama baxmasın; gözün kiçik xəta törədən bacı-qardaşına kinli qəzəblə baxmasın; gözün böyük zülm törədənlərə yaltaqlıqla baxmasın; gözün yetimə baxanda, ahıla baxanda yaşla dolsun. Qulaq haram səh:۶۶

qəbuledicisinə çevrilməsin. Qulaq haramları qəlbə ötürən zillətlik vasitəsi olmasın. Qəlbin məhəbbətlə dolu olsun – İlahi məhəbbətlə; şəfqət, riqqət, saflıq qəlbdən əskik olmasın. Qəlbdə zalıma hiddət, məzluma dəstəklə yanaşı olsun. Qəlbi elə qidalarla .qidalandırmaq lazımdır ki, Hüseyni olsun. Budur məhərrəmliyin hədəfləri

**özəl mübarək xüsusiyyət ۴**

Qeyd etdik ötən bəhslərdə ki, insanların pak fitrətində gizli bir İmam Hüseyn (ə) məhəbbəti var. Bu sevgi əsrlərdir ki, insanları Hüseynçi olmağa, İmam Hüseynlə (ə) beyət etməyə gətirib çıxarır. Və bu sevgidir ki, İmam Hüseynin (ə) adı gələndə .qəlblərin riqqəti ilə, gözlərin yaşarması ilə təzahür tapır

Bu məhəbbət ona görədir ki, İmam Hüseynə (ə) məhəbbət – gözəlliklərə məhəbbətdir. Ləyaqətə, izzətə, mərdliyə məhəbbətdir. Dönməzliyə, şücaətə, sədaqətə .məhəbbətdir

Hüseyn (ə) məhəbbətidir insanları gətirir əzadarlıq məclislərinə. Hüseyn (ə) məhəbbətidir insanları vadar edir haqqı deməyə, məzlumun yanında olmağa, rəzalətə “yox” deməyə. İmam Hüseyn (ə) eşqinin bərəkətləridir bunlar. Allah Təaladan istəyimiz .budur ki, bu eşqi qəlblərdə daha da şiddətli etsin

Allah Təala İmam Hüseynin (ə) mübarək şəxsiyyətində özəlliklər müəyyən etmişdir. O Həzrətin (ə) fərdi xüsusiyyət və bərəkətlərindən biri də budur ki, ondan sonrakı ۹ İmam (ə) onun nəslindəndir. ۴-cü İmam

Həzrət Zeynəlabidindən (ə) ١٢-ci İmam Həzrət Mehdi Sahib-əz-Zamanadək (ə.f.) .bütün İmamlar Əba Əbdillahın (ə) övladlarıdır, onun nəslindəndir

Əba Əbdillahın (ə) türbəti şəfavericilik xüsusiyyətinə malikdir. Onun qübbəsi dualar üçün müstəcəb olan bir məkan verilib Uca Allah tərəfindən. O Həzrəti (ə) ziyarət .edənlərin ziyarətə sərf etdiyi vaxt ömürlərindən sayımaz

İmam Mühəmməd Baqirdən (ə) və İmam Cəfər Sadiqdən (ə) bu məzmunda hədis nəql olunur:"Allah Təala İmam Hüseynin (ə) qətlinin əvəzi olaraq o Həzrətə dörd xüsusiyyət əta etmişdir: birinci - imaməti onun zəriyəsində (nəslində) qərar vermişdir; ikincisi - şəfanı o Həzrətin türbətində qərar vermişdir; ücüncüsü - onun qübbəsinin kənarında və altında dua müstəcəb olar; dördüncüsü - onu ziyarət edənlərin əyyamı ."ömürlərindən hesab olunmaz

**?Səni tapan nəyi itirmişdir**

İmam Hüseyn (ə) dühasını tanımaq üçün, o Həzrətin (ə) Allah Təala ilə münacatına diqqət edək. Həzrət (ə) dualardan birində buyurur: "Ey Allahım, Səndən başqa bir kimsəni sevməsinlər deyə, Öz dostlarının qəlbindən başqalarının məhəbbətini çıxaran Sənsən! ... Səni itirən nəyi tapmışdır? Səni tapan nəyi itirmişdir? Sənin əvəzinə başqası ."ilə razı olan zərər edib uduzmuşdur

Həqiqi məhəbbət ٢ ünvanı tanımaz. Bir qəlbdə ki, İlahi məhəbbət var – orada müvvəqətiyə, ötəriyə, dəyərsiz səh:٦٨

nəsnəyə məhəbbət olmaz. Allah Öz lütf nəzərini salır o insana ki, qəlbində İlahi .məhəbbət başqa məhəbbətləri çıxarır

Bunu bizə öyrədir İmam Hüseyn (ə). Əsl dəyərləri sevmək və dəyəri olmayan bir şeyin qəlbdə bütləşməsinə imkan verməmək. Allahı itirən bütün dünyanı əldə etsə belə, bir şey tapmamışdır – öyrədir bizə İmam Hüseyn (ə). Çünki, Allahı itrən vücudi bədbəxt olar, zəlil olar. Allahı tapanın heç nə itirə bilməməsini öyrədir bizə İmam Hüseyn (ə). Bu adamdan nəyi də alsalar – xeyri yoxdur. Əbəs çalışarlar. O, əsl dəyərə malikdir, nəyi .alsalar da, vücudun bir hissəsinə çevrilmiş bir tapıntını almaq iqtidarında deyillər

O kəs ki, Allahdan başqasının razılığını axtarır – uduzanlardandır. Müvəqqəti, asılı varlıq özünə nə verə bilib ki, başqasına da nə versin?! Çox heyfdir həyat ki, onu belə .işlərdə israf edəsən

İnsan hətta dəyərli keyfiyyətlər sahibi də ola bilər, amma hədəfi düz olmasa, nicat .tapmaz

Burada dəyərli alimlərdən birinin ibrətamiz kəlamını xatırlamaq yerinə düşür. Buyurur: “İnsan şücaətli ola bilər. Amma şücaət öz-özlüyündə kifayət deyil. Bir keyfiyyət var ki, şücaətin yanında olmasa, insan bədbəxt olar. Şücaət o zaman tam olur ki, insanda .”tədbirlilik də olsun

Aşuranı bütün digər qəhrəmanlıqlardan ayıran amil - bu iki xüsusiyyətin yanaşı olmasıdır. Hədəfi bilmək. Hədəfə doğru gedən yolu tanımaq. Bu yolu getməyin üsulunu .bilmək

## mübarək cəhətin təhlili ۲

İmam Hüseyn (ə) yolunun ən israrlı ardıcıllarından olan, zəmanəmizin vicdanlarından biri olan itkin düşmüş imam Musa Sədrin İmam Hüseynin (ə) mübarək vücudunun sözügedən ۲ cəhəti barədə çox dəyərli bir açıqlaması var. O Musa Sədrin ki, azğın düşmən heç cür yolundan döndərə bilmədiyi üçün oğurladı. Bəli, dəyərli islam alimi və mütəfəkkiri imam Musa Sədr, İmam Hüseynin (ə) bu iki mübarək cəhəti haqqında :təhlilindən öncə bəzi müqəddimələr buyurur

İnsanın təbiətindədir ki, bir işdə irəli getdikcə daha çox alışar və bu işi daha rahat – .(edər (yaxşı işdə də, pis işdə də belədir

Misal üçün, insan ilk dəfə siqaret çəkir. Acıdır, narahat olur. Amma sonra öyrəşir, hətta bir müddətdən sonra onsuz qala bilmir. Və yaxud, müsbət bir işi götürək – misal üçün, İmam Hüseynin (ə) anım mərasimlərinə getmək kimi. Əvvəl vərdiş etmir, digər işlər buna mane olur. ۱-۲ dəfə gedir, sonra vərdiş edir. Yaxud, elm ardınca getmək, dərs oxumaq – əvvəl insanın gözünə böyük görünür, vərdiş etdikcə, daha asan olur, sonra tamam rahat olur onunçün. Beləliklə, yaxşı işlərdə də, pis işlərdə də, insan müəyyən .əməli yaşatdıqda, nəticədə bu əməl onun naturasının bir hissəsinə çevrilir

İkinci müqəddimə ondan ibarətdir ki, hədəfə nisbətdə insanın hərəkət istiqaməti – .həmin hədəfə yaxınlaşmağın və ya uzaqlaşmağın əsas şərtlərindəndir

Hədəfə doğru hərəkətdə, əgər ondan kənaradırsa, addım-addım daha da hədəfdən uzaqlaşar, əgər ona tərəfdirsə - addım-addım ona yaxınlaşar. İnsan bir pis işi əvvəl başlayanda, yaxşı yoldan, hidayət yolundan bir qədər aralı düşür. Və bu trayektoriya sanki bir xətt üzrə gedir. Pis işi davam etdikcə, onun hidayət yolundan uzaqlaşması .daha da artır

Bu, o misaldandır ki, insan müəyyən hədəfə gedib çatmalıdır. Maşınla hədəfə getsə, hər dəqiqə yaxınlaşır. Amma hədəfdən sapanda, hər dəqiqə onunlə hədəf arasında .fasilə də artır

.Buradan yol göstərənlərin yeri və əhəmiyyəti bilinir

**Tədrici tənəzzül**

Gedək Kərbəla səhnəsinə. Bir qədər də daha keçmişə gedək. Həzrət Peğəmbər (ə) İlahi missiyasına uyğun olaraq, bütün həqiqətləri insanlara çatdırır. Sonra yavaş-yavaş, addımbaaddım hədəfdən yayınma başlayır. Rəsuli-Əkrəmdən (s) sonra onun vəsiyyətinə tam əməl olunmur və Həzrət Əlinin (ə) yolgöstərən olmasına maneələr törədilir. Bunun nəticəsində yoldan sapma baş verir. Birinci il ümmət Peyğəmbər (s) yolundan bir qədər kənarlaşır. Sonra bir qədər də. Beşinci il daha çox. Beləcə, ildən-ilə ümmətin Peyğəmbər (s) yolundan sapması daha da çox olur, İlahi yolla yaranan fasilə daha da böyük olur. Nəticədə ümmət o qədər sapır düz yoldan ki, Kərbəla faciəsi kimi ...bir dəhşətli cinayətin baş verməsinə laqeyd olur. Peyğəmbərin (s) balasını öldürürlər

İnsan ilk əvvəl kiçik bir günah edir, sadə görünən bir günah. Sonra vərdiş edir. Sonra .ondan ayrı düşə bilmir. Getdikcə də fasilə böyüyür

Əvvəl ancaq qarnını doydurmaq üçün bir iş görür, sonra bir az da, bir az da, yavaş-yavaş günaha vərdiş edir. Birinci xətadan, ikici xətadan hələ qayıtmaq şansı yetərincədir. Amma getdikcə vəziyyət dəyişir – əvvəl böyük görünən xətalar onun üçün çox kiçik görünür artıq. Əvvəl bir məzlumun haqqını pozanda, gecə yata bilmirdi, ürəyi ağrıyırdı. Amma getdikcə haram iş görmək onun üçün adiləşir. Oraya qədər ki, .artıq günah və haram onun həyatının tərkib hissəsi olur

Kərbəlada da olanlar birdən-birə o duruma düşməmişdi ki! Birdən-birə gəlib ümmətin İmamını (ə) şəhid edib, balalarını əsir götürməmişdi ki! Əvvəl harama doğru bir addım .atır, sonra yenə və yenə - nəticədə mənfur bir duruma düşür

Oraya qədər ki, Allaha qarşı addım atır. Bu olur fəal tənəzzül. Bunlar olur fəal şeytan. .Mərhələli surətdə gəlib çıxır insan fəal şeytan səviyyəsinə

**Kərbəlada birləşən iki qrup**

Amma imam Musa Sədrin təhlilində digər bir maraqlı nöqtə də var. Bunlar olmasa, fəal şeytanlar olmaz. Bunlar elə bir mühit yaradırlar ki, fəal şeytanlar öz eybəcərliklərini edə bilirlər. İmam Musa Sədr bunları “lal şeytan” adlandırırdı. Bunlar – sükut .edənlərdir. Laqeyd çoxluqdur

Fəal şeytanlar sayca az olarlar. Onları qüvvətli və qüdətli edən – lal şeytanların .çoxluğudur

İnsan birdən-birə lal şeytan da olmur. Əvvəl kiçik bir məsələdə danışmalı olanda, danışmır. Əvvəl kiçik bir zülmə sükut edir. Sonra bir az daha böyüyünə və sonda da lap böyük zülmlərə sükut edir. Bu da olur lal şeytan. Biri fəal şeytana çevrilir. O birisi lal .şeytana çevrilir. Hər ٢ qrup da mərhələli surətdə bu tənəzzülə yetişir

Kərbəla müsibətinin də baş verməsində bu iki qrup birləşdilər: biri fəallıqla, biri sükutla. Bu ٢ qrupun ittifaqı Kərbəla müsibətinə gətirib çıxartdı. Nəticədə oldu Kərbəla. .Nəticədə oldu bəşəri cinayət

İmam Səccad (ə) Kərbəla müsibəti ilə bağlı buyurub: “Mən bir kəsin övladıyam ki, (o,) .”“qutilə sabra”dır

Allah! Allah! Nədir “qutila sabra”? Bir adamı və ya ümumən canlını ki, diri ikən o qədər zərbə vuralar, yaralayalar ki, tədricən bunların təsiri altında dünyasını dəyişə - “qutilə .sabra” deyilir

İslam inancına görə bu, bir dəhşətli haram işdir. Amma gözləri qan tutmuş fəal ...!?şeytanlara nə haram

Əba Əbdillahı (ə) bu cür qətlə yetirdilər. İmam Hüseyn (ə) ٣٣ nizə yarası, ٣۴ qılınc ...zərbəsi və daha hansı müsibətlər ilə tədricən şəhadətə yetişdi

Amma öz şəhadətiylə İmam Hüseyn (ə) Kərbəlada əslində bu sapmanın, bu qaranlığın .üzərinə bir işıq saldı. Düz yolu göstərdi. Çünki, hidayət çırağıdır. Çünki, nicat gəmisidir

İmam Hüseyn (ə) Kərbəlada əslində kiçik fitnələrlə mərhələli surətdə yoğrulmuş bir böyük fitnənin qaranlıq zülmətində boğulan ümmətə xilas gəmisini təqdim etdi. Bu gəmiyə minənlər xilas oldular. Bəşərin məhvi vardı lal şeytanlarla fəal şeytanların o mənfur ittifaqında. O qədər əməli fitnələr bürümüşdü ümməti ki, artıq ümmətin heyi .qalmamışdı fitnələrə sinə gərsin. Məhv olub gedirdi ümmət

Öz mübarək vücuduyla nur saçdı İmam Hüseyn (ə), öz müqəddəs şəhadətiylə dağıtdı o ittifaqı. Batmağa, boğulmağa doğru gedən bir toplumu xilas etdi. Və Qiyamətədək insanları fəal şeytanlıqdan imtina edib, tövbəkarlara çevrilməsinə və lal şeytanlıqdan imtina edib, danışan insana, Allah bəndəsinə çevrilməsinə yardım edir bu nicat ...gəmisi

## Aşuranın əsas dərsi

Gedək Aşura gününə... İmam Hüseynin (ə) Aşura günü etdiyi mühüm çatdırışlardan birinə diqqət edək: "Bilin! Bu haramzadə oğlu haramzadə məni ۲ yol arasında qoyub: qılınc və zillət! Zİllətə qatlaşmaq bizdən çox-çox uzaqdır. Allah, Onun Peyğəmbəri (s), möminlər, (bizim tərbiyə olunduğumuz) pak ətəklər, qeyrətli qəlblər, alicənab ruhlar ."!qəbul etməzlər ki, biz alçaq bir başçıya təslim olmağı şərəfli ölümdən üstün tutaq

İmam Hüseyn (ə) buyurur ki, düşmən mənə xar və zəlil olmaqla şəhadət arasında bir ...seçim qoyub. Zəlil halda yaşamaq, ya da izzətli ölüm – seçim bu idi Aşura günü

səh:۷۴

Bir izzət dərsi var bu çardırışda. Bir şücaət dərsi, necə yaşamaq dərsi var bu çatdırışda. İmam Hüseyn (ə) bütün insanlığa dərs keçir. Aşura gününün niyə olmaqlığı, necə olmaqlığı, bütün mahiyyəti var bu çatdırışda. Aşuranın fəlsəfəsi var bu mübarək .deyimdə

Əslində İmam Hüseynin (ə) bizə ən mühüm tövsiyəsi budur ki, insan hər zaman seçim arasındadır. Və seçim arasında olanda, diqqətli olmalı. Bilin ki, bu seçim sizin aqibətinizi müəyyən edir. Zilləti, xarlığı, bədbəxtliyi heç zaman seçməyin. Həyatınız bahasına olsa .da belə

İmam Hüseyn (ə) bizə tanıtdırır ki, Allah yolunu seçmək istəyirsinizsə, baxın yolun hansı sizə izzətlilik gətirir, hansı isə zəlillik. İstəyirsinizsə Rəsuli-Əkrəmin (ə), Həzrət Əlinin (ə), Həzrət Zəhranın, Həzrət Həmzənin, Əbazərin, Salmanın, Meysərin və Allah övliyası olan digər qeyrətli qəlblərin və alicənab ruhların yolu ilə gedəsiiz – izzətliliyi .seçin

İnsanların fitrətində Əba Əbdillaha (ə) olan məhəbbət məhz buna görədir. Bu izzətliliyə görədir, bu şərafətlliyə görədir. Namuslu yaşama dəvətə görədir. Bu seçimin – izzətlilik .(seçiminin simvoludur İmam Hüseyn (ə

Həyatımızın bütün anları üçün, bütün səhnələri və çalarları üçün bir həyat formulu öyrədir bizlərə İmam Hüseyn (ə). Heç bir şərtlər altında, heç bir vəziyyətdə, heç bir .durumda izzətliliyi əldən verməmək düsturunu

### Aşuranın daha bir çaları

Gedək Aşura səhnəsinə. Çoxlu dərslər var, çoxlu çalarlar, nöqtələr var burada. Nə ...qədər tədqiq etsən də, bitmək bilmir bu dərslər

Aşuranın sübhündən əsrinədək Əba Əbdillahın (ə) mübarək səhabələrindən, məsləkdaşlarından müqavimət göstərmək iqtidarında olanların hamısı artıq şəhadətə yetişmişdir. Nəhayət o zaman yetişir ki, İmam (ə) minlərlə yezidin müqabilində tək-tənha qalır. Ümmətin İmamıdır Həzrət Hüseyn (ə). Axıradək kimisə hidayət etmək, qana susamışların cərgəsindən çıxararaq xilas etmək üçün davamlı çağırış edirdi: "Varmı köməyə yetişən bir kəs ki, Allaha xatir Rəsulullahın Əhli-beytini müdafiə ."!?etsin

Lənətlik Şümr cinayətlərini tamamlamaq üçün yezid qoşununun piyadaları ilə İmamı (ə) dövrəyə alırlar və hər tərəfdən həmlələr edirlər. Bu zaman bu səhnəyə dözə bilməyən İmam Həsənin (ə) kiçik oğlu Abdullah xeymədən çıxır. Abdullah İmam Həsənin son yadigarıdır. İmam Həsən (ə) balasının cəmi ۱۱ yaşı var. Əmisi ilə Kufəyə yollanmışdır. Kufə karvanı Aşura karvanına çevrilir. Aşura gününün əsri yaxınlaşdıqca, bu karvanın nəyi varsa, Allah yolunda qurban verilir. Fədakarlığın bütün zirvəsi ...buradadır. Bəşəriyyətə fədakarlıq dərsi keçilir burada

Aşuranın əsri yaxınlaşır. Yezid əmrini yerinə yetirən yezidlər mühasirə halqasını sıxlaşdırırlar. Əlinin (ə) və Zəhranın (s.ə) nəvəsi, İmam Həsən (ə) oğlu Abdullah bu .səhnəyə dözmür. Görür əmisi Kərbəla meydanında tək qalıb

Abdullah xeymədədir. Hələ həddi-büluğa yetişməyib. Digər uşaqlarla və qadınlarla birgə xeymədədir. Amma Abdullah daha xeymədə qala bilmir, Əba Əbdullahın bu ...vəziyyətinə dözə bilmir. Abdullah birdən atır özünü xeymədən bayıra

**Kiçik vücuduyla difa edən bala**

İndi xanım Zeynəbin (s.ə) halını təsəvvür edək. Bir tərəfdən Əba Əbdillah (ə) meydanda təkdir, qərib və tənha vəziyyətdədir. Lənətlik Şümr o Həzrətə (ə) sonuncu həmləni etmək üçün yezid tör-töküntülərinin başında mühasirə halqasını sıxlaşdırır. Bu tərəfdən də Həsən (ə) yadigarı, hələ həddi-büluğa çatmamış Abdullah meydana getmək istəyir. Zeynəb (s.ə) kəsir balaca Abdullanın qarşısını. Zeynəb bu gün daha kimləri qurban verməyib?! Zeynəb bilmir kimə baxsın... Düşmən mühasirəsində olan qardaşı Hüseynə (ə) baxsın, yoxsa Həsən (ə) yadigarı Abdullaha. Zeynəb (s.ə) düşünür ki, Abdullanın qarşısını kəsə bilər. Abdullah isə deyir: "Bibican, mən qala bilmrəm. And ."!olsun Allaha, mən Hüseyni (ə) tənha qoymayacağam

Abdullah atır özünü xeymədən bayıra, verir özünü cəng meydanına. Abdullah istəyir öz kiçik vücudu ilə Əba Əbdillahı (ə) müdafiə etsin. Bəli, Abdullah həddi-büluğa çatmayıb. Amma qəlbi həddi-büluğa, zehni həddi-büluğa çatmışdır Abdullah... Bilir iman nədir, qeyrət nədir. Çatır İmam Hüseynə (ə). Bu an yezidlərdən biri İmama (ə) şəmşirlə zərbə endirir. Abdullah öz kiçik mübarək əlini verir qabağa. İti qılınc Rəsulullah (s) övladının əlini kəsir, səh:٧٧

.bədəndən ayırır. O cür vəziyyətə gətirir ki, ancaq dərisilə bədəndən asılır

İlahi, bu nə müsibət! Bu nə səhnə! Aşura səhnəsi təşnə balalar üçün su gətirən pəhləvan Əbülfəzlin iki qolunun kəsilməsilə başlayır, İmamını (ə) müdafiə edən kiçik ...Abdullahın qolunun kəsilməsilə yekunlaşır

İndi Əba Əbdullahın (ə) halını təsəvvür edək. Bu gün kimləri yola salmayıb, kimləri itirməib Əba Əbdillah (ə)... İmam Hüseyn (ə) Abdullahı bağrına basır. Qulağina .”pıçıldayr: “Qardaşoğlu! Səbir et və Allahı çağır, ta O, səni saleh atana qovuşdursun

Sonra İmam (ə) əllərini duaya qaldırır. İmam (ə) dua halındadır. Bu halda lənətlik Hərmələ Abdullahın mübarək vücuduna ox atır. Abdullah Əba Əbdillahın qucağında ....şəhid olur

Bir diqqət edək: Abdullah öz əmisi Əbəlfəzl kimi qolsuz qalır, əmisi oğlu Əli Əsğər kimi Hüseynin (ə) qucağında şəhid olur... Nələri görmədi Aşura səhnəsi... Nə qədər ...fədakarlıq, nə qədər ixlas, nə qədər ibadət, nə qədər dözüm

Və digər tərəfdə nə qədər zülm, nə qədr qəddarlıq, nə qədər rəzillik! Nə kiçiyə, nə böyüyə rəhm edilməyib burada. Bəşər tarixində nə böyük rəzilliyə qol qoyulmuş ...burada

İlahi, neçə illər keçir o gündən. Nə qədər kəşf olunmuş, nə qədər ixtiralar edilmiş. Amma iblis nökərləri öz xislətlərindən əl çəkmirlər. Zəmanə yezidləri öz mənfur .əməllərindən əl çəkmirlər

səh:٧٨

Kərbəla müsibətində ۵ uşaq şəhid edilmişdi. Amma bu gün zülmü həyata keçirmə vasitələri o qədər artıb ki, artıq hər gün Fələstində, digər bölgələrdə neçə-neçə uşaq ...şəhid edilir

Lakin bununla yanaşı, Kərbəla ilahi məktəbinin ana qayəsi olan düşünmək azadlığı uğrunda vücudi sərgiləmələr, günümüzdə şəxsiyyət və hürriyyət təşnəsi olan bəşər .övladlarının aydınlaşmasını daha da şiddətləndirmişdir

### Aşuranın çatdırdığı Qədir–Xum mesajları

İmam Hüseynin (ə) Kərbəlada qəhrəmanlığı sayəsində İslamın yaşaması, dinin kamil halda qalması – Qədir-Xumla bir vücudi tədayilik yaradır. Burada dərin bir assosiativ rabitə vardır. Yada salsaq, dinin kamilləşməsi ilə bağlı konseptual yanaşmalar əslində Qədir-Xum fenomeninə aid edilmişdir. İslam nə zaman ən kamil hala gəlib çatır? Nə zaman Rəbbimiz Quranda buyurur ki, "bu gün dini sizlər üçün kamala çatdırdım"? Bir məsələlər var ki, əgər onlar olmasa, din kamala çatmır. Nəsə bir mövzu var ki, əziz Peyğəmbərimiz (s) onu deyəndə, Rəbbimiz dini kamala çatdırır, nemətləri tamamlayır, .İslamı insanlıq üçün razı olduğu bir din halına gətirir

Belə başa düşülür ki, Aşura növbəti dəfə Qədir-Xumun mesajını əməli surətdə topluma çatdırmadır. Aşura – bir İlahi sığortalamadır ki, insanlar əbədi olaraq bu .məsələdən azmasınlar

Qədir-Xumda bir mühüm mesaj var idi. O da bu idi ki, Peyğəmbərdən (s) sonra yerlə göyün əlaqəsi bitmir, insanlar

özbaşına qalmır. Necə ki, Həzrət Peyğəmbər (s) insanlar üçün Allah tərəfindən hüccət idi, insanlar onunla olduğu halda səma ilə bağlantı olacaqdı və Peyğəmbər (s) özündən əvvəlki yüz iyirmi dörd min peyğəmbərin (ə) missiyasını yerinə yetirib yekunlaşdırırdı, Peyğəmbərdən (s) sonra bu davamiyyət İmamlara (ə) keçir. Mesaj budur ki, əgər onlarla – məsum ١٢ İmam (ə) ilə mübarək bağlantını itirməsək, mövcud olacağıq. Müqəddəs Kitabımız olan Qurani-Kərim açıq-aşkar bildirir ki, əgər Peyğəmbərimizdən (s) sonra İmam Əlinin (ə) ümmətə İlahi rəhbərliyi ilə bağlı bu çatdırış səsləndirilməsə, insanlar bununla bağlı dəqiq və birmənalı məlumatlandırılmasa, din kamala çatmır. Həzrət Peyğəmbərə (s) bildirilir ki, bu çatdırış olmasa, Peyğəmbər (s) öz nübuvvət risalətini, Allah Təala tərəfindən vəzifələndirilmiş elçiliyini tamam etməmiş olur. Namaz, oruc, bütün digər İslami işlər yarımçıq qalır. Bu qədər şəhid verilir, bu qədər müsibətlər olur, Peyğəmbərin (s) başına min cür müsibət gətirilir, üzünə daş vurulur – .bütün bunlar yarımçıq qala bilər

Qədir-Xumda bir mühüm çatdırışla din kamala çatır. İlahi imamətin davamlılığının elanı ilə İslam dini mövcudiyyətini gerçəkdə tapmış olur və davamiyyəti bərpa edilir. İnanclılıq və dindarlıq İlahi İmamların (ə) ətəyindən yapışmaqla kamala çata bilər və bəyənilmiş hala gələ bilər. Lənətlik Yezidin dövründə bunu kökündən kəsmək istəyirdilər. Daha bir pəncərə, bir nəfəslik də qoymaq istəmirdilər ki, insanların ən pis şəraitdə də belə İlahi hüccətin ətəyindən yapışmaq imkanı olsun. Onlar bunu kökündən yığışdırmaq istəyirdilər. İslamın cövhərini, mahiyyətini aradan aparmaq .istəyirdilər

Aşura gününün mahiyyətini dərk etmək üçün Qədir-Xum günündə baş verənlərlə müqayisəsinə, bu iki hadisənin müqayisəli paralellərinə nəzər salmaq önəmlidir. Qədir-Xum günündə minlərlə, onminlərlə insan İmam Əlinin (ə) yanına gəlir, beyət edirlər. Sonradan isə, Həzrət Əlinin (ə) padşah olmadığını, sultan olmadığını, ədalətli .İlahi rəhbər olduğunu görəndə öz beyətlərini sındırırlar

Bəli, cahil insanlar elə bilirdilər ki, Peyğəmbər (s) məktəbinin ən layiqli yetirməsi olan Həzrət Əli (ə) padşah ola bilər. Bəli, İmam Əlinin (ə) padşah olacağı ehtimalına inanan bəzi insanlar ona beyət etməyə gəlmişdi. Padşaha əlbəttə ki, beyət etmək üçün gələnlər çox olar. Birinin padşah olmaq ehimalı olanda, çox adam özünü onun yanında görmək istəyər. Sonradan görürlər ki, Əmirəlmöminin (ə) padşahlıqdan kənarda saxlandı, evdə oturur və s. Bunun səbəbi o idi ki, onlar İmam Əlini (ə) gerçək imam kimi, İlahi rəhbər kimi tanımamışdılar. Əgər Həzrət Əlini (ə) İlahi imam kimi tanısaydılar, onminlər üçün Əlinin (ə) taxtda və ya evdə oturmasının bir fərqi olmazdı. Həzrət Əlini (ə) imam kimi tanıyıb ətəyindən yapışsaydılar, İlahi hüccətin zahiri .məqamının onlar üçün heç bir fərqi olmazdı

Qədir-Xumun verdiyi acı dərs budur. Aşuranın müsibəti Qədir-Xuma qayıdır. Aşurada müsibət var. Lakin, bundan heç də kiçik olmayan müsibət – Qədir-Xumun müsibətidir. İmam Əlidən (ə) sonrakı İlahi hüccət – İmam Həsənlə (ə) bağlı da eyni vəziyyət yaşanır. Deyirlər, “İmam Həsən (ə) bir söz deyir, Müaviyə (lən) başqa bir söz deyir. Biri səhv deyir, biri isə düz deyir. Nəhayətdə, biri bir savab qazanır, digəri iki savab qazanır”. Bax belə, İlahi rəhbəri hansısa cani ilə müqayisə edirlər. İmam Həsəni (ə) İlahi

hüccət kimi qəbul edən heç zaman belə bir müqayisə etməyə cəsarət etməz. Bunün .özü də növbəti böyük bir müsibətdir

## Aşuranın beyət edənləri İmamı (ə) İlahi hüccət olaraq tanıyanlardır

Bu cinayətləri törətmiş nəslin insanları və onların övladları Kərbəlada növbəti nanəcibliyə hazır olurlar. Belə olmur ki, insanlar birdən-birə Peyğəmbər (s) nəvəsini şəhid etməyə qalxsınlar. Qədir-Xumda Həzrət Əliyə (ə) beyət edənlərlə Aşurada İmam Hüseynə (ə) beyət edənləri müqayisə edən zaman İlahi hüccət anlayışını tam dərk etmək olur. Böyük ariflərdən birinin buyurduğundan bu nəticə çıxır ki, Qədir-Xumda onminlərlə insan İmam Əliyə (ə) beyət edir, padşah olmayandan sonra isə onu tərk edirlər. Kərbəlada İmam Hüseynə (ə) beyət edənlərə isə Əba Əbdillah (ə) özü getməyi buyurur. Onların üzərində heç bir öhdəlik saxlamır, beyətlərini geri götürür və getməyə icazə verir. Bildirir ki, Yezidin (lən) işi onunladır və onlar isə azaddırlar, gedə bilərlər. Lakin, onlar getmirlər. Qədir-Xumda insanlar heç nə deyilməmiş, özləri beyətlərini pozurlar. Aşurada isə İmamın (ə) getmə izninə baxmayaraq, onu tək qoymurlar. Fərq - bircə məsələdədir. İmam Hüseynlə (ə) şəhid olanlar Əba Əbdillaha (ə) İlahi İmam kimi etiqad edirdilər. Onlar Əba Əbdillahı (ə) Yer üzərində Allahın hüccəti bilirlər. Belə olan halda onlar hara gedə bilərlər? Fərq bu qədər ciddidir. Əba Əbdillahın (ə) da heç bir iddiası yoxdur. Məsləkdaşlarının da heç bir iddiası yoxdur. İmam Hüseyn (ə) və məsləkdaşları bunu Allah bəndəsi olmaq üçün edirlər. Kufəlilər özləri çağırır, İmam Hüseyn (ə) onların köməyinə gəlir, sonra istəmirlər, o zaman ki, getmək istəyir, buraxmırlar, bu vaxt namaz üçün izn istəyir. Son ana qədər onlarla döyüşmək istəmədiyini

bildirir. Kim olduğunu yadlarına salır, izah edir. Çünki İmamdır (ə), Allahın hüccətidir. Axıradək insanları batil yoldan çəkindirmək, haqq yola dəvət etmək missiyasını həyata .keçirir. Heç olmasa bir nəfəri də xilas etmək üçün çalışır

**Əhli–beytin aşuradan sonra başlanan missiyası**

Məhərrəm–Səfər əyyamının günlərinə də nəzər salmaq çox önəmlidir. Aşuradan sonrakı günlər bir sıra əlamətdar xüsusiyyətləri ilə yadda qalıb. Yəni, hadisələr yalnızca Aşura gününün bitməsi ilə yekunlaşmayıb. Məhərrəm ayının on birinci günü, yəni Aşura gününün səhəri bir neçə önəmli hadisə baş verir. Bunlardan biri əsirlər karvanının yola düşməsidir. Ömər ibni Səd (lən) Aşura cinayətinin başa çatmasından sonra Məhərrəm ayının on biri günortayadək

hər kəsin Kərbəlada qalmasını əmr edir. Öz ordularından öldürülənləri, cəhənnəmə vasil olanları torpağa tapşırırlar. Bu, bir haldadır ki, Həzrət Huseyn (ə) və onun şəhid olmuş əzizlərinin pak bədənləri Kərbəlanın isti torpaqları üstündə qalıb. Gün yarıya çatanda Ömər Səd (lən) göstəriş verir və İmam Hüseynin (ə) əhli-beytini, əsirlər karvanını Kufəyə yola salmağa başlayırlar. İmam Səccad (ə) xəstə olduğu halda .zəncirlənir və o Həzrəti də (ə) bu karvana daxil edirlər

## Xanım Zeynəbin (s.ə) qətligahda qardaşına (ə) müraciəti

Əsirlər karvanı qətlgahın yaxınlığından keçərkən xanımların ağlamaları, əzadarlıqları başlayır. Kərbəla tamam fərqli bir səhnəyə çevrilir. Xanım Zeynəb (s.ə) dolmuş gözlərlə qardaşının pak bədəninə tərəf üz tutub buyurur: "Ordu qarət olan kəsə qurban olum! Xeymələrinin ipi kəsilən kəsə qurban olum! O kəsə qurban olum ki, nə itkindir ki, qayıtmasına ümid olsun, yaralarının sağalmasına ümid olsun! O şəxsə qurban olum ki, canım ona fədadır! Qurban olum o şəxsə ki, kədərli ürəklə, susuz dodaqlarla şəhid edildi! Qurban olum o şəxsə ki, üzündən qan damır!". Bununla da əsirlər karvanının hərəkəti başlayır və qətlgahdan keçir. Bu səhnələri, bu anları anlamaq, dərk etmək .olduqca çətindir

## Aşuradan sonra ilk etirazlar başlayır

Məhərrəmin on birinci günü baş verən ikinci önəmli hadisə - Ubeydullah ibni Ziyadın (lən) məclis qurması və Əhli-beyti (ə) həmin məclisə daxil etməsidir. Məhərrəmin on birində Ömər Səd (lən) İmamın (ə) mübarək başını ibni Ziyada (lən) göndərir. Bu (münasibətlə ibni Ziyad (lən

məclis qurur, camaatın da iştirakı üçün imkan yaradılır. Əba Əbdillahın (ə) müqəddəs, nurani başı bu məlunun qabağına qoyulur. İbni Ziyad (lən) əlindəki cubuqla Əba Əbdillahın (ə) mübarək başına cürət edir. Bu zaman Zeyd ibni Ərqəm adında bir müsəlman ayağa qalxır və fəryad çəkir. Bu, tarixdə kifayət qədər önəmli səhnələrdən biridir. Zeyd deyir: "Əlindəki çubuqları Hüseynin (ə) dodaqlarından kənara çək. Peyğəmbərin (s) övladını təhqir etmək olmaz. Sən kəsilmiş başına çubuqla vurduğun Hüseynin dodaqlarını Peyğəmbərin (s) dəfələrlə öpdüyünü görmüşəm!". Sonra isə Zeyd ağlamağa başlayır. İbni Ziyad (lən) hiddətlənərək ona deyir: "Sakit ol! Əgər səhabə olmasaydın, səni yetərincə kötəkləməyə əmr edərdim".

Amma, Zeyd ibni Ərqəm qorxmur, cəsarətlə ayağa qalxır, fəryad etməyə başlayır: "Ay camaat, Allahdan başqasına bəndəlik etdiniz, Hüseyni (ə) – Fatimənin (ə) övladını öldürüb, Mərcanənin oğlunu özünüzə ağa seçdiniz. Allaha and olsun ki, o, sizin yaxşılarını öldürəcək, pis insanları sizə hakim edəcək, sizi öz quluna çevirəcək". Sonra üzünü ibni Ziyada (lən) çevirərək deyir: "Ey ibni Ziyad! Peyğəmbərin (s) müsəlmanlara dönə-dönə tapşırdığı əmanətlə gör necə rəftar etdin".

Məhərrəm ayının on birində görürük ki, artıq etirazların ilkinləri başlanır. Yezid (lən) artıq öz cinayətlərini elə rahatlıqla davam etdirə bilmir.

### Kərbəla şəhidlərinin pak cənazələrinin dəfn olunması

Məhərrəm ayının on ikinci günü də bir neçə mühüm hadisələr baş verir. Bunların birincisi Kərbəla şəhidlərinin dəfnidir. İkincisi isə, Kərbəla əsirlərinin Kufəyə daxil olmasıdır. Bəni-Əsəd qəbiləsindən olan bir qisim insanlar səh:۸۵

İmam Hüseyn (ə) və onun əshabının pak bədənlərini dəfn etmək üçün Kərbəlaya gəlir. Bədənlər başsız və çoxunun qılınc zərbələri ilə parça-parça olduğu üçün tanınması mümkün olmur. Bəni-Əsəddən gələn insanlar bu mənzərəni görəndə heyrətə gəlirlər. Bu zaman Həzrət İmam Səccad (ə) İlahi bir lütf ilə oraya təşrif gətirir və bədənlərin kimliyini bir-bir onlara tanıtdırır. Həzrət İmam Səccad (ə) əziz atası İmam Hüseynin (ə) pak cəsədini hönkür-hönkür ağlayaraq özü dəfn edir. Sonra qəbrin üzərində bu sözləri yazır: "Bu məzar - susuz və qərib halda qətlə yetirilən Hüseyn ibn Əli ibn Əbu Talibindir (ə)".

**Əsirlər karvanı ilk dəfə Kufədə Yezid (lən) zülmünü ifşa edir**

Məhərrəm ayının on ikinci günü üçün çox önəmli olan digər bir hadisə - Kərbəla əsirlərinin Kufəyə daxil olmasıdır. Hicri təqvimi ilə ۶۱-ci il Məhərrəm ayının ۱۲-də sübh vaxtı Əhli-beyt (ə) əsirləri Kufəyə daxil olurlar. Şəhidlərin müqəddəs başlarını onların qarşısında tərpədib hərəkət etdirirlər. O karvanı şəhərin bütün küçə və bazarlarında dolandırırlar. Rəvayətçi bu hadisənin bir bölümünü belə nəql edir: "Gördüm ki, Kufə camaatı ac halda oturan cocuqlara çörək və xurma verirdilər. O zaman Həzrət Ummi Gülsüm (s.ə) bu mənzərəni müşahidə etdikdə fəryad çəkir: "Ey Kufə camaatı! Bizim sülaləyə sədəqə haramdır!". Çörək və xurmanı uşaqların əlindən alıb qaytarır. Kişi və qadınların səsləri ucalanda Həzrət Ummi Gülsüm (s.ə) yenə də buyurur: "Ey Kufə camaatı! Kişiləriniz bizi öldürür, qadınlarınızı isə bizə ağlayır. Allah Qiyamət günü bizimlə sizin aranızda hökm edəcək!". Bu zaman artıq Həzrət Zeynəb (s.ə), Həzrət Ummi Gülsüm (s.ə) və Həzrət İmam Zeynəlabidininin (ə) hər biri ayrıca çıxışlarla onlara xitab səh:۸۶

edirlər. Bu çıxışlarda Əhli-beytin (ə) fəzilətlərindən əlavə olaraq, İmam Hüseynin (ə) və onun əshabının məzlumluğunu, kufəlilərin vəfasızlığını və beyəti sındırmaqlarını .xatırladırlar. Yezidin (lən) bu zülmünü və zülmani hökumətini ifşa edirlər

## Kufəlilər insanların ikiləşməsi fenomenini ortalığa çıxarır

Çox ağrılı məsələdir. Bəzən insanlar bir tərəfdən cinayət edirlər, digər tərəfdən ağlayırlar. Bir tərəfdən zülmü edirlər, zülmü yaşadırlar, digər tərəfdən məzlum olmuşlara ağlayırlar. Günümüz üçün də yayılmış məsələlərdəndir. Nəhayət etibarilə, Aşuranın öyrətdiyi ən önəmli məsələ - insanın şəxsiyyətinin bütövləşməsidir. Kufə camaatı bəşəriyyətə bir mühüm məsələni öyrədir. Bir tərəfdən öldürüblər, digər tərəfdən ağlayırlar. Allah özü müsəlman ümmətini bu ikiləşmə halından qorusun. Mahiyyətcə Məhərrəm ayının on ikinci gününün səciyyəvi xüsusiyyəti bu olur ki, artıq ifşa etmə mərhələsi başlanır. Günbəgün irəli getdikcə, bu, daha da artır və Yezidin .(lən) cinayətləri tamamilə ifşa olunur

## Həzrət Səccadın (ə) Kərbəlanı anlatmaq missiyası

Məhərrəm ayının on ikinci gününün bir tarixi hadisəsi də var ki, bəzi rəvayətlərə görə, Həzrət İmam Səccadın (ə) şəhadəti bu günə təsadüf edir. İmam Zeynəlabidin (ə) otuz dörd il mübarək İmamlığını (ə) həyata keçirir və nəhayətdə zəhərləndirilərək şəhadət anına gəlib çatır. İmam Səccadla (ə) bağlı incə bir buyuruş var. Ustadlar buyurur ki, Kərbəla və Aşura hadisələrinin, ümumiyyətlə o günlərin ən böyük məzlumlarından biri - Həzrət İmam Səccaddır (ə). Bütün səh:٨٧

müsibətləri görür, həmin müsibətləri yaşayır, bütün müsibətləri içərisindən keçirir, daha sonra əsir olaraq da bu müsibətləri yaşayır. Sonra da bunu yaşayaraq çatdırmaq və ifşa etmək, insanlara ötürmək missiyası daşıyır. Bu, bir halda baş verir ki, hər ...zaman Kərbəla yadına düşərkən o müsibəti vücudunda yaşayır

**...Kərbəla şəhidlərinin pak qanları olmasaydı**

Məhərrəm-Səfər əyyamının yalnız ilk ongünlüyünün deyil, tam şəkildə yaşadılması həm də Aşuradan sonra baş verən hadisələrə diqqət çəkməyə, onlar barədə xəbərdar olmağa, öyrənməyə imkan verir. Aşuradan sonrakı günlərə nəzər salanda görürük ki, Yezid (lən) və onun tör-töküntülərinin bu mərhələdəki əsas hədəfi - Aşura cinayətindən sonra sağ qalanları da özlərinə tabe etdirmək, etiraz potensialını sındırmaq idi. Aşuradan sonra sağ qalan Əhli-beyt (ə) əsirlərini elə bir hala salmaq istəyirlər ki, onlar təslim olsun, artıq bütün ümidlərini kəssinlər və tabe olduqlarını ifadə etsinlər. Mahiyyətcə Yezid (lən), Həzrət Peyğəmbərin (s) gətirdiyi həqiqi İslamın bununla məhvinə nail olmaq istəyirdi və "Əməvi İslamı" kimi bir hoqqanı bərqərar etmək istəyirdi. Bununla da İslamın bəzi zahiri atributlarından başqa heç bir şey qalmayacaqdı. Necə ki, Qədir-Xumda İmam Əlinin (ə) Peyğəmbər (s) canişini seçilməsi elan olunmasaydı - İslam olmayacaqdı, eləcə də Yezid (lən) öz cinayətlərini hədəfinə çatdıra bilsəydi, mübarək İslam dini - Rəsulallahın (s) gətirdiyi bir din olmayacaqdı. Əba Əbdillah (ə) canını fəda etməsəydi, Kərbəla şəhidləri Allah yolunda öz həyatlarından keçməsəydi, Aşura günü yaşanmasaydı, İslamın mahiyyəti aradan gedəcəkdi. Amma, Kərbəla səh:٨٨

şəhidlərinin pak qanları İslamı Zəmanə Sahibinin (ə.f) zühuruna qədər olan dönəmə qədər təhvil verir və Zəmanə Sahibinin (ə.f) zühuru ilə, inşəallah, bəşəriyyət İslam ilə .öz yekun halına və fəlsəfəsinə gəlib çatacaq

### Aşura həqiqətlərini çatdırma vəzifəsi

Aşura gününün əsr vaxtından sonra yeni bir mərhələ başlayır. Bu, bir mərhələdir ki, Həzrət İmam Hüseyn (ə) öz İlahi vəzifəsini ən böyük şərafətlə icra edib. Öz missiyasını qurtarıb. Öz əziz məsləkdaşları ilə birgə, öz əziz vücudunu Allah yolunda qurban verib. Artıq yeni bir mərhələdir. Pak qanlar axıb, qurbanlar verilib, vücudi səhnələr yaradılıb. Bütün varlıq aləmini lərzəyə gətirən, vəcdə gətirən bir səhnələr. Əsri-Aşura – .Kərbəlada baş verənlərin zirvəsidir, pik nöqtəsidir

Bundan sonrakı mərhələdə Əba Əbdillahın (ə) mübarək əhli-beytini Kərbəlada əsir etdi azğın düşmən. İmam Hüseynin (ə) əhli-beyti yeni bir İlahi vəzifəni götürdü çiyinlərinə. Onlar şahididir bu müsibətin. Onlar bu müsibəti dünyaya çatdırmalıdırlar. Onlar səbir, .dözüm və dönməzliyin, sınmamağın yeni bir qəhrəmanlıq salnaməsini yazmalıdırlar

Bu mərhələdə ən əsas nöqtə odur ki, düşmən Kərbəla əsirlərini sındırmaq istəyir. Onları zəlil etmək istəyir. O həddə çatdırmaq istəyir düşmən onları ki, üzülsünlər, mənəvi müqavimət üçün taqətləri qalmasın. Və başda Xanım Zeynəb (s.ə) və İmam Zeynəlabidin (ə) olmaqla, Kərbəla əsirlərinin mühüm missiyası var – olan həqiqətləri

.bəşəriyyətə çatdırmalıdırlar. Onlar insanları bu cinayətlərdən gərək agah etsinlər

Onlar insanlara haqqı çatdırmaqla, xəbərdar etməklə, ayıltmaqla yaxşılıqlara dəvət və pisliklərdən çəkindirmək vəzifəsini yerinə yetirirlər. Onlar hər fürsətdən, hər əlverişli .andan istifadə edirlər ki, Aşura günü yaşanan o həqiqətləri insanlara çatdırsınar

### İmam Səccad (ə) müsibəti

Burada bir haşiyə çıxaq. Böyük ariflər deyirlər ki, hələ məlum deyil, İmam Hüseynin (ə) çəkdiyi müsibət daha ağırdır, yoxsa İmam Zeynəlabidinin (ə) çəkdiyi müsibət. Belə ki, Kərbəla şəhidləri öz İlahi missiyalarını yerinə yetirib, Allahın rəhmətinə qovuşdular. Amma həyatının ۲۳-cü ilinə qədəm qoyan İmam Əli ibn Hüseyn - İmam Zeynəlabidin (ə), xəstəliyi səbəbindən və imamət xəttinin qorunması barədə atası İmam Hüseynin (ə) tapşırığına əsasən, döyüşdə iştirak etməkdən məhrum oldu. Və bütün bu şəhadət səhnələri onun mübarək gözləri qarşısında baş verdi. Bunu yaşamağın özünün qeyri-mümkün həddində olması bir yana, o Həzrət (ə), İslam düşmənləri tərəfindən əsir götürülməyin olmazın müsibətini də çəkməli idi. Üzərində olan məsuliyyəti – Peyğəmbər (s) əhli-beytindən ibarət olan əsirlər karvanını imkanı daxilində qorumaq da dilə gəlməyən dərəcədə ağır məsuliyyətlərdən biri idi. Və İmam Səccad (ə) əsas missiyasını – Kərbəla həqiqətlərini dünyaya çatdırmaq və İslam düşmənlərini ifşa .etmək vəzifəsini də həyata keçirməli idi

Nə qədər qəlbi sızıldadan bir vəziyyət – həm Əhli-beytin (ə) körpələrinə sahib çıxmaq, onlara nəvaziş etmək, mehribanlıq göstərmək, həm səbir və dözümlülük təcəssümü olmaq, həm də əmr-be-məruf (yaxşılıqlara dəvət etmək) və nəhy-əz-münkər (pisliklərdən çəkindirmək) vəzifəsini yerinə yetimək.

### Kufə əhlinə tanıtım

Həzrət Əli ibn Hüseynin - İmam Səccadın (ə) vücudi missiyası ilə daha aydın tanış olmaq üçün bir neçə nöqtəyə toxunaq. Artıq əsirlərin Kufəyə gətirildiyi bir vaxtdır. Bu, həmin Kufədir ki, bir müddət öncə onminlərlə məktub yazıb, İmam Hüseyni (ə) dəvət etmişdilər. Qeyd edək ki, yezid lənətlik Əhli-beyti (ə) zəlil etmək niyyətilə əsirləri şəhərbəşəhər gəzdirib, şənliklər təşkil etmək istəyirdi ki, onları incitsin. Öz uğurları hesab etdikləri o bəşəri cinayəti nümayiş etdirib, lovğalanmaq istəyirdilər. İndi əsirlər Kufəyə daxil olanda, həmin minlərlə kufəlilər çıxıblar ki, onlara tamaşa etsinlər. Və hələlik anlamırlar ki, həmin o dəvət etdikləri Əhli-beytdir (ə) həmin bu əsirlər. Və İmam Səccad (ə) həmin bu camaata buyurur: "Ey Kufə camaatı! Mən - Əlinin (ə) və Fatimənin (s.ə) övladıyam, Peyğəmbərin (s) övladı Əliyəm! Mən – uşaqları öldürülmüş, var-dövləti talan olunmuş, xanədanı əsir alınaraq, qarşınızda saxlanılan İmamın (ə) övladıyam. Siz atama (İmam Hüseynə (ə)) məktub göndərərək, dəvət etdiniz. O sizə tərəf gəldikdə isə, onu öldürdünüz. Ey Kufə camaatı! Sabah, Qiyamət günündə Allahın və

Peyğəmbərin (s) cavabını necə verəcəksiniz?! Siz Peyğəmbərinizin hörmətini saxlamadınız. Onun ruhunu incitdiniz. Vay sizin halınıza! Siz çox pis adamlarsınız!".

Hər söz İmam Səccadın (ə) dilindən çıxdıqca, Kufənin mühiti dəyişirdi. Yezid lənətliyin düzənlədiyi planlar – şənlik etmək, öz cinayətlərini qələbə kimi təqdim edib, camaatı da buna şərik etmək – alt-üst olurdu. Vəziyyət Yezid lənətliyin özünə qarşı işləməyə başlamışdı.

**İbn Ziyadın zəlil edilməsi səhnəsi**

Digər səhnəyə toxunaq. Yezidin (lən) Kufədə vali qoyduğu lənətlik İbn Ziyadın məmurları ona çatdırırlar ki, Kufədə ab-hava dəyişir. İbn Ziyad da deyir ki, yəqin saraya gəlib, burada bir təmtəraq görəndə sarsılarlar, məğlubiyyətlərini qəbul edərlər. İndi təsəvvür edək, nə qədər cəmiyyət yığılıb, təmtəraq düzənlənib, hamısı da əsirlərə tamaşa edir. Adət üzrə piyada, səhra-biyaban ilə dincəlmədən gələn, bütün yaxınları öldürülmüş insanlar belə vəziyyətdə necə olarlar? Amma Kərbəla əsirlərinin nəinki bu ab-havadan ruhiyyələri dəyişir, onlar burada bir vüqar, izzət səhnəsi yaradırlar və o qədər izzətlə, vüqarla daxil olurlar ki, İbn Ziyad lənətlik bu səhnədən qəzəblənir və istəyir onlara hörmətsizlik etsin, amma cəsarəti çatmır.

İmam Səccadın (ə) burada bir buyuruşu olur. Buyurur: "Ey Ziyadın oğlu! Bu gün qüdrət taxtında oturubsan, Peyğəmbərin (s) övladları isə qarşında durublar. Ey Ziyadın oğlu, belə güman etmə ki, bizim nəzərimizdə qiymətli bir dəyərin vardır".

İmam (ə) bu cinayətkara çatdırır ki, harada otursan da, dəyərin yoxdur, Peyğəmbərin (s) Əhli-beytindən (ə) heç bir zaman üstün ola bilməzsən və belə bir işlərlə bizim nəzərimizdə qüdrətli görünmək istəyirsənsə, böyük səhvin var. Zəlillik bizdən .tamamilə uzaqdır

O qədər təsir edir ibn Ziyada bu bir neçə kəlmə söz ki, çox narahat olur və hətta əmr verir ki, İmamı (ə) qətlə yetirsinlər. Amma əsirlərin – neçə müddət məhrumiyyətlər içində piyada yol gedən və olmazın məşəqqətlərə məruz qalmaqlarına baxmayaraq, həqiqi izzət və əzəmətin təcəssümü olan bu müqəddəs insanların təsiri o qədər idi ki, Übeydullah ibn Ziyadın başında olanlar belə, bu təsirin altına düşürlər və cinayətkar .valini bu qərardan daşındırırlar

Amma burada bir səhnə də yaşanır ki, yüzillər sonra da bütün azadxah insanların qanını cuşa gətirir. İmam Səccad (ə) buyurur: “Məni öldürməklə qorxudursan?! .”Öldürülmək – bizim adətimiz, şəhid olmaq isə - kəramətimizdir

Bu bir neçə sözlə İmam (ə) bütün məsələlərin nöqtəsini qoyur. Atası Hüseyn (ə) də, babası Əli (ə) İlahi dəyərlər uğrunda canlarını veriblər. Və İmam Səccad (ə) da hər an buna hazırdır. Və o toplumlar ki, şəhid verməyə, amallar uğrunda həyatlarından belə keçməyə hazır olan oğullar yetişdirir - heç zaman zəlil olmaz. Düşmən nə qədər .qüdrətli və güclü görünsə də

İmam Səccadın (ə) mübarək şəxsiyyətini bir qədər yaxından tanımaq üçün, bu Həzrətin (ə) həyatından olan bəzi nümunələrə toxunaq. O cümlədən, İmam Səccadın (ə) alicənablıq və genişqəlbliliklə bağlı qoyduğu irsə nəzər yetirək. Nəql edirlər ki, ömrünün müəyyən vaxtında İmam (ə) həccə gedirmiş. Amma istəmirmiş ki, onu tanısınlar və buna görə özgə bir karvana qatılaraq, yol gedir. Uzun yoldur, İmam (ə) çalışır öz səfər yoldaşları olan zəvvarlara xidmət etsin, onlara qarşı çox diqqətli olur. Yolun yarısında karvana bir nəfər qoşulur ki, İmam Səccadı (ə) görən kimi tanıyır və həmin karvandakılara deyir ki, “sizə xidmət edən bu şəxsi tanıyırsınız?”. Deyirlər: “Xeyr, tanımırıq. Mədinəli bir gəncdir və çox yaxşı bir adamdır”. O adam deyir: “Bəli, tanımırsınız. Tanısaydınız, heç zaman razı olmazdınız ki, o, sizə xidmət etsin”. O adam İmamı (ə) tanıdır ki, bəs, zəmanənin İmamıdır (ə), Həzrət Peyğəmbərin (s) övladıdır, Həzrət Əli (ə) nəvəsi, İmam Hüseynin (ə) oğludur. Bu tanıtmanı eşitcək, zəvvarlar narahat olub, gedirlər İmamın (ə) yanına ki, “Ağa, niyə bizi bu vəziyyətə saldınız? Siz bizə xidmət edəsi adam deyilsiniz. Əyləşin lütfən, biz sizə xidmət edək”, – deyə xahiş edirlər. İmam (ə) cavab verir ki, məhz elə ona görə tanımadığı karvanla getdi ki, .zəvvarlara xidmət etmək, yoldaşlıq etmək imkanı olsun

Hər addımları əxlaq dərsi və ibrətdir əziz İmamlarımızın (ə)! Əməldə təzahür edilən bir dərs. Bu dəyərli insanlar yalnız Aşuranın və Aşuradan sonra yox, həyatın hər bir .səhnəsinin qəhrəmanıdırlar

Təbərrük üçün İmamın (ə) həyatı boyunca Aşuranı necə yad etməsinə də toxunaq. Deyirlər ki, İmam Səccad (ə) su içmək istəyərkən, gözü suya sataşdıqda, mübarək gözlərindən yaş süzülməyə başlayırdı. Bunun səbəbini soruşanda, buyurardı: “Yezid lənətliyin adamları suyu vəhşi və yırtıcı heyvanlar üçün azad qoyub, amma atamın üzünə bağladıqları (və onu susuz qoyduqları) bir halda, mən necə ağlamayım?!”.

İmam Səccad (ə) buyurardı: “Həzrət Fatimənin (s.ə) balalarının ölümü yadıma düşərkən, qəhər məni boğur”.

Bir gün İmama (ə) deyirlər: “Sizin qəm-qüssəniz qurtarmaq bilmir”. İmam Səccad (ə) cavab verir: “Vay olsun sənə! ١٢ oğlundan biri itmiş Yəqub peyğəmbər (Həzrət Yusifin əhvalatına işarədir) öz oğlunun ayrılığına o qədər ağladı ki, gözü kor oldu. Qəm-qüssəsinin çoxluğundan beli büküldü. Halbuki, oğlu sağ idi (yəni onu tapmaqdan ümidini tam üzməmişdi). Amma mən bədənləri bir-birinin yanında yerə düşmüş atamın, qardaşımın, əmimin və əhli-beytdən ١٧ nəfərin öldürülməsini öz gözlərimlə gördüm. Bu halda mənim qəm-qüssəm heç qurtararmı?!”.

İmam Səccad (ə) Allaha münacatla bağlı, dua mədəniyyəti ilə bağlı zəngin bir irs qoymuşdur. O Həzrətin “Səhifəyi-Səccadə”si hər zaman təravətli olan bir münacat toplusudur.

### Cinayətləri ört-basdır etmək cəhdi

Qeyd etdiyimiz kimi, Kərbəla cinayətlərində öz hədəfinə çata bilməyən Yezid (lən), bu cinayətlərdən sonra da öz hədəflərinə çata bilməyib. Bunun bariz nümunəsini

biz Kərbəlanın əsirlər karvanında olan Əhli-beytin (ə) davranışlarında görürük. İmam Hüseynin (ə) Əhli-beyti (ə) Aşuradan sonra zülmün evini ifşa etmək, zülmün sütunlarını sarsıtmaq, Yezidin (lən) bu cinayətlərini insanlara çatdırmaq missiyasını böyük şərəflə yerinə yetirir. Belə səhnələrdən biri - Məhərrəm ayının ۱۳-də Əhli-beyt (ə) əsirlərinin gətirildiyi İbn Ziyad (lən) sarayında yaşanır. Əhli-beytin (ə) əsirləri saraya daxil olur və Xanım Zeynəb (s.ə) da həmin əsirlərin arasında olur. İbni Ziyad (lən) özünün cinayətkar misssiyasını yerinə yetirməyə başlayır. İbn Ziyad (lən) deyir: "Allaha şükür ki, sizi rüsvay edib öldürdü və sizin dedikləriniz yalan çıxdı". Diqqət etsək görərik ki, bu məlun, bu kafir Allah sözünü işlədir. Bunlar toplumun, kütlənin illərlə yaşadığı müsəlman kimliyindən bəhrələnirlər. Mahiyyətcə, etdikləri cinayəti ört-basdır etmək üçün Allahın mübarək adından istifadə edirlər. İnsanların anladığı bir dildə danışırlar. Törətdikləri cinayətlərin Allahın razılığı ilə baş verməsini iddia edirlər. Həyasızcasına deyirlər ki, "Aşuranın olmasını Allah lazım bildi, belə də oldu" (nəuzibillah!). Təbii ki, məlunun bu hiylələri ifşa olunur. Və bu səhnələrdən başlayaraq, həm də İslam tarixində ilk dəfə cinayəti edənlər öz günahlarını kənara qoymağa, cəbriliyi gündəmə gətirməyə cəhd .edirlər

### Xanım Zeynəb (s.ə) Əhli–beytin (ə) məqamını xatırladır

İbn Ziyadın (lən) cavabında Xanım Zeynəb (s.ə) buyurur: "Allaha şükür ki, bizi öz Peyğəmbəri Muhəmmədlə (s) əziz edib, pisliklərdən pakladı. Fasiq rüsvay olur, günahkarlar yalan danışır. Və biz o şəxs deyilik, başqasıdır". Burada Xanım Zeynəb (s.ə) bir neçə mesaj vermiş olur. Birincisi, orada toplaşan insanlar da

müsəlmanlardır, Quran oxuyanlardır. Onlara Quranın Əhli-beyt (ə) haqqında ayəsini xatırladır. Əhli-beytin (ə) dərəcəsini, mübarəkliyini, paklanmış olmalarını xatırladır. Ardınca onların deyil, fasiqin, ibn ziyadların (lən) rüsvay olduğunu çatdırır. Əhli-beytin (ə) deyil, günah sahiblərinin yalan danışdığını çatdırır. Bildirir ki, sadalanan vəziyyətə .düşən onlar deyil, Kərbəlada cinayət törədən yezid (lən) tör-töküntüsüdür

**Əməvilərin İslama cəbrilik gətirmək cəhdləri**

İbn Ziyad (lən) yenə də öz cinayətkar çıxışına davam edir: "Allahın qardaşınla və Əhli-beytinlə (ə) etdiyini necə görürsən?". Yenə də öz cinayətlərinin Allahın üzərinə qoyulmasına cəhd edildiyini görürük. Bununla bu virusu avamların beyninə da salmağa, öz cinayətlərini pərdələməyə çalışır. Həzrət Zeynəb (s.ə) isə öz cavabı ilə onların bütün dediklərini, bütün murdarlıqlarını faş edir: "Allah tərəfindən gözəllikdən başqa bir şey görmədim. Onlar bir dəstə şəxs idi ki, Allah onlar üçün şəhadəti qərar vermişdi və onlar əbədi yerləri üçün tələsdilər və orada uyudular". İslamın gerçək məntiqi ilə İslama xurafatı, cəbriliyi salmaq cəhdlərinin qarşıdurmasını bu dialoqda .görürük

Məhərrəm ayının on üçüncü günündə Ubeydullah ibni Ziyad (lən) Yezidə (lən) məktub yazır. Məktubda Aşuranın yekunlarını çatdırır. Məktubun cavabında artıq Həzrət İmam Hüseyn (ə) və digər şəhidlərinin başlarını əsirlərlə birlikdə Şama tərəf gətirmək göstərişi verilir. Beləliklə, bu məktubun cavabı olaraq Şama doğru hərkət etmək əmri verilir. Səfər ayının birinci günü Əhli-beytin (ə) əsirləri Şama daxil olur və burada bir .sıra önəmli hadisələr baş verir

səh:٩٧

## Şam əhli və günümüzdə bunun irsi davamçıları

Şam əhlinə rəsmən bayram etmək tapşırığı verilir. Tapşırıq verilməsi öz yerində, Şam əhli özü də rəsmən bayram edir. Onların halı, durumu bu cürdür. İnsanlar var idi ki, Aşura günü xına vurardılar, bayram ruhiyyəsində olardılar, o günü xüsusi bayram süfrəsi açardılar, bayram orucu tutardılar. Onlar bunu belə çatdırırdılar ki, Allahın düşməni (nəuzibillah!) həmin gün qətlə yetirilib və bu günü bayram edirik. Aşura gününü bayram etmək kimi çirkli ənənə Şamın əhlindən gəlir. Aşura günü bayram etmək rəzilliyi buradan gəlir. Aşura günü bayram etmək - Yezidin (lən) irsindən gəlir. .Kimsə həmin gündə bayram etmək istəyirsə, deməli ruhunu ora bağlayır

## Şam səhnələri Peyğəmbər (s) səhabəsinin dili ilə

Əhli-beytin (ə) əsirləri Şama daxil olanda bayraqlar asırlar, şəhəri bəzəyirlər, mənfi mənada xüsusi, iyrənc təmtəraqla buna hazırlaşırlar. Bu tarixdə xüsusi olaraq qeyd də olunur. Həzrət Peyğəmbərin (s) səhabələrindən olan Səhl ibni Səd nəql edir: “Beytul-Müqəddəsə hərəkət edən zaman yolüstü Şama çatdıq. Şəhərə çatan zamanı şəhəri bəzənmiş və şənliyə hazır gördük. Qadınlar təbil və dəflərlə şənliyə tələsirdilər. Elə təsəvvür etdim ki, bu məntəqədə bayram var ki, mənim ondan xəbərim yoxdur. Axtarış və sorğulardan sonra anladım ki, təəssüf, camaatın şənliyinin səbəbi qəlbləri dağlanmış Əhli-beytin (ə) Şama daxil olmasıdır. Alçaq şamlılar məlun Yezidin (lən) göstərişini yerinə yetirməkdə səhlənkarlıq etməmişdilər. Evlərin damlarına rəngarəng bayraqlar sancıb, hər bir keçiddə də şərab məclisi

qurmuşdular. Camaat dəstə-dəstə şəhərin darvazasına axışırdı ki, əsirlərin karvanına tamaşa etsinlər. Əhli-beytin (ə) şəhidlərinin müqəddəs başlarını saat darvazasından içəri daxil etdilər. Ən öndə Bəni-Haşimin qəməri – Həzrət Abbas ağanın (ə) başı idi. Başlar arasında Şəhidlər Ağasının (ə) pak başı dodaqlarında təbəssüm olduğu halda, əzəmətli, fövqəladə bir cah-cəlalla gözə dəyirdi. Şərəfli saç-saqqalını külək sağa-sola tərəf tərpədirdi". Bu, Peyğəmbər (s) səhabəsini dəhşətə gətirən səhnələrdir. Yezid (lən) əmr və göstəriş verib – bu, onun zatından irəli gələn bir işdir. Amma insanların da .bu nanəcibliyi etmək tutumları olub

Şamda çox ibrətli bir səhnə də var. Səhl ibni Səd deyir: "İmam Səccadın (ə) xidmətinə yetişdim. Salam və ədəblə özümü tanıtdım. Həzrət İmam Səccad (ə) mənə buyurdu: "Bacararsansa, atamın başını aparan nizə tutana pul ver ki, onu aramızdan aparsın, ."”Peyğəmbərin (s) hərimine tamaşa edənlərin sayı azalsın

Bəli, bu, qeyrətin bir abidəsidir. Bu vəziyyətdə, bu fəlakətdə İslamın daşıyıcısı olan əziz İmam (ə) ona çalışır ki, camaatın dağılışması üçün, xanımlara tamaşa etməməsi üçün ...əlindən gələni etsin. İslamı başa düşmək üçün bircə bu epizod bəsdir

səh:۹۹

Bu əyyam bitəndən sonra hərə öz həyatına bir cür davam edəcək. Bir qisim insanlar bu əyyam bitdikdən sonra, həyatlarını diametral surətdə dəyişirlər: gündəlik burulğan onları öz orbitinə çəkir və bir müddətdən sonra, artıq məhərrəmliyin onun ovqatında qoyduğu izlər tədricən silinir. Xoş olsun o insanların halına ki, bu əyyamda duyduqlarını, bu dönəmdə yaşadıqlarını, bu əyyamda əldə

.əldə etdiklərini qoruyub saxlaya bilr; ilboyu bu haləti yaşada bilr

Bu əyyam insana çox məsələlər öyrədir. Amma mərkəzi xətt kimi, Kərbəla məktəbində bu dərs keçir: izzəti, ləyaqəti heç zaman, heç bir şəraitdə, heç bir kəsə, heç bir məsələyə görə güzəştə getməmək. Hər zaman, hər şəraitdə və hər vəziyyətdə izzəti qorumaq dərsini keçir. İmam Hüseyn (ə) buna görə həyatından keçib: razı olmayıb o .Həzrət (ə) öz izzətini, ləyaqətini heç bir şeyə, o cümlədən, həyatına da belə dəyişməyə

Bu əyyam insana Aşura məktəbinin müxtəlif çalarlarını, müxtəlif fraqmentlərini öyrədir. İmam Hüseynin (ə) uğrunda vuruşduğu dəyərlər; Əba Əbdillahın (ə) ən ağır vəziyyətlərdə səbirlilik, təvəkkül, iman, şücaət nümayiş etdirməsi; düşmənə qarşı belə rəhimli və şəfqətli olması; hər an Allahla qırılmaz rabitədə olmaq durumu və saysız-hesabsız digər dərslər var burada. Yaxud Xanım Zeynəbin (s.ə) o müsibətli Aşuradan, sonrakı misilsiz ağır imtahanlardan ən yüksək səviyyədə çıxması kimi dərslər var burada. Və bu dərslər nəzəri səciyyəli qalmamalıdır. İnsanın gündəlik həyatında öz .real əksini tapmalıdır

**Ərbəin günü**

Ərbəin günü. İmam Hüseynin (ə) öz qəhrəman məsləkdaşları ilə şəhid olmalarından ۴۰ gün ötür. Ərbəin günü - bir gündür ki, İmam Hüseynin (ə) müqəddəs məzarı ilk olaraq həmin gün ziyarət olunmuşdur. Ərbəin günü Peyğəmbərimizin (s) ən yaxın səhabələrindən olan Cabir ibn Abdullah Ənsarinin adı ilə bağlıdır. Rəsuli-Əkrəmin (s) bu sevimli və əziz məsləkdaşı ilk şəxsdir ki, İmam Hüseynin (ə) şəhadətinin ۴۰-cı günü - «ərbəin» günü, hicrətin ۶۱-ci ili

səh:۱۰۱

səfər ayının ٢٠-də bu müqəddəs məzarın ziyarətinə gəlmişdir. Cabir Ənsarinin yaxınlarından olan Ətiyyə belə nəql edir: «Cabir ibn Abdullah Ənsari ilə İmam Hüseynin (ə) ziyarəti üçün Mədinədən çıxdıq. O zaman ki, Kərbəlaya yetişdik, Cabir Fərat çayının kənarına getdi və qüsl aldı. Sonra libasını geyindi və ətir vurdu. Sonra hər addımında zikr deyə-deyə İmam Hüseynin (ə) qəbrinə tərəf getdi. O vaxt ki, İmam Hüseynin (ə) qəbrinin kənarına çatdıq, mənə söylədi: «Əlimi pak qəbrin üzərinə qoy» (cənab Cabir Ənsarinin gözləri artıq görmürdü). Mən belə də etdim. Bu anda gördüm ki, Cabir qəşş elədi və qəbrin üzərinə yıxıldı. Bir az üzünə su vurdum. O vaxt ki, Cabir özünə gəldi, ٣ .«dəfə: «Ya Hüseyn! Ya Hüseyn! Ya Hüseyn!» dedi

Ərbəinlə bağlı cənab Cabir Ənsari – Peyğəmbərimizin (ə) qocaman səhabəsi ki, Ərbəin günündə İmam Hüseynin (ə) müqəddəs məzarını ziyarət etdi – bir mühüm nöqtəni vurğulamışdır. Cənab Cabir Ənsari – o kəsdir ki, əziz Peyğəmbərin (ə) insan yetişdirən bağının ən nəcib meyvələrindəndir. Bəli, həmin bu cənab Cabir Ərbəin günü Kərbəlanın əziz şəhidlərinə salam verdikdən sonra, bu sözləri deyir: “Biz də sizin daxil olduğunuz .”(aid olduğunuz, etdiyiniz) işə şərik idik

Cabir Ənsarini müşayiət edən, bu qocaman möminə yolda yardımçı olan həmin Ətiyyə :adlı insan xatırlayır

Ona dedim: “Ey Cabir! Biz əziyyət çəkmədik, qılınc vurmadıq! Bu insanların başları“ bədənlərindən ayrılıb, ailələri tənha qalıb, uşaqları yetim qalmışdır. Necə ola bilər ki, biz əcrdə, savabda onlarla şərik olaq?”. Cənab Cabir cavabında buyurur: “Ətiyyə! Mən öz iki qulağımla Allahın Rəsulundan (s) eşitmişəm ki, buyurub: “Hər kim bir camaatın əməlini sevsə, o əməlin

savabında onlarla şərikdir”. Sonra dedi: “Ey Ətiyyə! Rəsulullah (s) buyurdu: “Mənim də .””əshabımın niyyəti – Hüseynin (ə) və əshabının həmin niyyətidir

**”Mən gözəllikdən başqa bir şey görmədim“**

Sevmək. Nifrət etmək. Aşura başdan-başa sevgidən və nifrətdən bəhs edir. Aşurada hər şey İlahi məhəbbətdən və Allaha xatir olan nifrətdən, eybəcərliyə nifrətdən .yoğrulub

Bu gün biriləri tapılır ki, sevgi kimi, məhəbbət kimi duyğulardan öz çirkin, fəsad planlarını irəli aparmaq üçün istifadə edir. Biriləri tapılır ki, məhəbbət kimi ülvi hissi o dərəcədə bayağı və primitiv edir ki, hətta bunun üçün təqvimdə günlər də uydurur – öz .rəzillik dolu əməllərini yaşatmaq üçün

Amma bir günlər var ki, başdan-başa həqiqi sevgini simvolizə edir. İnsanlara həqiqi sevgini öyrədən bir günlər. Allah xatirinə nifrətin nə olduğunu çatdırır. Aşura – bu .günlərdəndir. Ərbəin – bu günlərdəndir

Həzrət Peyğəmbərin (s) və Əhli-beytinin (ə) mübarək vücudi çeşməsindən su içmiş cənab Cabir, Ərbəin günü bir daha bu dərsi keçir. Ərbəinlə bağlı yaşanan mövzularda bu, həmin dəst-xəttin davamıdır ki, Xanım Zeynəb (s.ə) Aşura sonrası müsibətlərlə əlaqədar düşmən ona mənəvi dağ çəkmək istədikdə, “Mən (Kərbəlada) gözəllikdən başqa bir şey görmədim” deyərək, gözəllik və eybəcərliyin həqiqətdə nə olduğu barədə bəşəriyyətə dərs keçmişdi. Bütün bu ağrılara, olmazın məşəqqətlərə, müsibətlərə gözəllik adı verir. Çünki, Allah üçündür. Həqiqi Gözəlliyin yolunda olduğu üçün özü də gözəldir. Bunlar bir kəslərdir ki, insan duyğularının ən ali dərəcələrindən .dərs verirlər

## Allahı dərk edən özünü kiçik görər

Kərbəlanın çatdırdığı əsas mesajlardan biri – Kərbəla qəhrəmanlarının mərifətləridir. Onlar öz Rəbblərini tanıyıblar. Allahı tanıyandan sonra insan özünün kiçikliyini anlayır. Allahı tanımayan insanın mənəm-mənəmliyi çox olur. Kərbəla şəhidinin xüsusi cəhəti budur ki, o, Rəbbini tanıyır. Rəbblərini tanıdıqları üçün kiçiklərini də izhar edirlər. Həzrət Əmirəlmömin (ə) mübarək "Nəhcül-Bəlağə"sində buyurur: "Allahın böyüklüyünü dərk edən insanın gözündə hər şey kiçik görünər". Allahın böyüklüyünü dərk edən insan üçün hər şey, o cümlədən özü də kiçikdir. Alimlərdən biri Xanım Zeynəbin (s.ə) məqamı haqqında buyurur: "Əgər bir insan Xanım Zeynəbin (s.ə) məqamının nə dərəcədə yüksək olduğunu bilmək istəyirsə, Xanım Zeynəbin (s.ə) bu kəlamına diqqət etsin. Əsirlər şəhidlərin cənazələri ilə vidalaşarkən, Xanım Zeynəb (s.ə) qardaşı İmam Hüseynin (ə) cənazəsinin kənarında dayanır, əllərini göyə qaldırır və Allaha belə münacat edir: "İlahi, bu az qurbanlıqları bizdən qəbul et"". Allahı tanıyan adam özünün, özünün etdiklərini kiçik görür. Allahı tanıyan adam öz şəhidlərini az qurban görür. Allahı .tanıyan adam öz gördüyü işləri naqis görür

İnsanların çoxu Allah yolunda bir az iş görən kimi onu olduqca böyük bir məsələ kimi göstərməyə çalışır, digərlərinə minnət qoymağa başlayır. Çünki, insanların mərifəti, Allahı dərki yerində deyil. Amma Həzrət Zeynəb (s.ə) öz şəhidlərini "az qurbanlıqlar" adlandırır. Kimdir o az qurbanlıqlar? Əba Əbdillahın (ə) tikə-tikə doğranmış bədəni və vücudu! Bəşəriyyət bundan böyük müsibət görməyib. Lakin, Həzrət Zeynəbin (s.ə) mərifəti o səviyyədədir ki, o, öz şəhidini az qurbanlıq kimi görür. Kərbəla məktəbinin .verdiyi dərslər bunlardır

səh:۱۰۴

### Həzrət Zeynəbin (ə) gözəllik dərsinin mahiyyəti

Xanım Zeynəbin (s.ə) yüksək məqamını dərk etmək üçün Kərbəladan sonra yaşanmış səhnələrə nəzər salmaq çox önəmlidir. Kərbəlada sonra əsir alınmış Əhli-beyt (ə) ailəsi İbni Ziyadın (lən) sarayına gətirilir. İbni Ziyad (lən) Xanım Zeynəbə (s.ə) ünvanlayaraq deyir: "Gördünmü, Allah ailənizin başına nə gətirdi?". İbni Ziyadın (lən) nəfsani məntiqinə görə hadisə elə bu cür olub. O, hesab edirdi ki, Kərbəla şəhidləri öldürüldü, başları nizələrə vuruldu, Əhli-beytin (ə) əyalı əsir düşdü və s. O, öz dünyəvi müstəvisində hadisələri bu cür qanır. Onun tutumu budur. Həzrət Zeynəb (s.ə) .”buyurur: “Mən (Kərbəlada) gözəllikdən başqa heç bir şey görmədim

Xanımın (s.ə) məntiqi - gözəllik məntiqidir. Kərbəla - Xanım (s.ə) üçün bir Allah dərgahıdır. Oraya gələnlər Allah bəndələridir. Ora gələnlər də Allahın hüzuruna gəliblər və Allaha ən gözəl, bəyənilmiş şəkildə qovuşublar. Xanım (s.ə) da bu qovuşmada yalnız gözəllik görür. Çünki, Xanımın (s.ə) məntiqində başlanğıcda Allah var, son da Allahadır. İbni Ziyad (lən) tör-töküntülərinin isə məntiqi tamamilə fərqlidir. Bəziləri qəflətdədir, .bəzilərinin də vəziyyəti elə bu cür rəzildir

### ...Bəşəriyyət belə bir şey görməyib

Bir tarixçi öz yazılarında qeyd edir: “Doğrudan da bəşəriyyət tarixində hansı bir qadını tapmaq olar ki, onun yeddi qardaşını öldürsünlər, oğlunu şəhadətə yetirsinlər, on qardaşoğlu və əmioğlusunu qılıncdan keçirsinlər, sonra da özünü bütün bacıları və qardaşı uşaqları ilə birlikdə əsir alsınlar. Belə bir vaxtda o, əsir ola-ola öz haqqını və eləcə də şəhid olanların haqqını müdafiə etsin. Özü də elə bir səh:١٠٥

şəhərdə, elə bir binada ki, atasının hakimiyyət mərkəzi olmuş və atası təqribən hakimiyyətinin dörd ilini həmin binada keçirtmişdir. Belə bir vəziyyətdə və bu cür narahatçılıqlarla nəinki təkcə başına gələnlərdən narazı deyil, hətta qətiyyətlə bildirir ki, "biz öz meylimizə zidd olan heç bir iş görməmişik. Əgər bizim kişilərimiz şəhadətə yetişiblərsə, elə gəlişlərindən məqsədləri də bu olmuşdur. Əgər bundan başqa bir iş olsaydı, onda narahat olmağa dəyərdi. Yəni biz öz istəyimizə çatmışıq. İndi ki, onlar Allah qarşısındakı öz vəzifələrini çox yüksək səviyyədə yerinə yetirib, şəhadət zirvəsinə nail olublar, biz bu işin müqabilində Allah qarşısında şükürdən başqa hansı bir .layiqli iş görə bilərik?"". Budur xanımın gözəllik dərsinin mahiyyəti

## Əyyamın hüzünlü yekünü

Rəsuli-Əkrəm (s) bu günlərdə Rəbbinə qovuşub. Bu kədərli günlərin təhlili, müsəlman ümmətinin gəlib yetişdiyi bu acınacaqlı vəziyyətin səbələrinin açıqlanmasına yardım edir. Peyğəmbərimizin (ə) rehləti (dünyanı tərk etməsi) öncəsi, rehləti zamanı, rehlətdən sonra cərəyan edən səh:١٠۶

hadisələrin, ümmətin zillətə düşməsində birbaşa təsiri var. Hətta demək olar ki, Aşuranın baş verməsinə səbəb olan amillər öz başlanğıcını məhz həmin günlər yer .alan hadisələrdən götürür

Hicrətin ١١-ci ili idi. Əziz İslam Peyğəmbəri (s) sonuncu həcc səfərində - istər Məkkədə, istər Ərəfə çölündə, istər Qədir-Xum adlanan o məşhur məntəqədə, istərsə də artıq Mədinəyə qayıtdıqdan sonra, ümməti zaman-zaman özündən sonrakı duruma hazırlayırdı. Ürəyi ağrılı ümməti özünün tez bir zamanda dünyadan gedəcyi barədə məlumatlandırır, bir gün bu dünyaya vida deməsini çatdırır insanlara Peyğəmbərimiz (s). Özündən sonra müsəlmanların nə etmələri haqqında xəbərdar edir onları .(Rəsulullah (s

O zaman üçün də, bu gün üçün də ən mühüm mövzulardan biri - həmin günlərdə baş vermiş məlum olaylardır. Amma təəssüflər olsun ki, Həzrət Peyğəmbərin (s) son günlərdə etdiyi çatdırışlarını bu və ya digər səbəblərdən unutdurmağa çalışanlar da az deyil. Bəzi cahillər o zaman da cəhd etdilər, hər zaman da çalışırlar - ya bilərəkdən, ya bilməyərəkdən - insanları inandırsınlar ki, bəs İslam Peyğəmbəri (s) gəldi, öz işini gördü, sonra dünyanı tərk etdi və özündən sonra insanların nə etməli olduqları barədə məlumat və tövsiyələr vermədi. Guya işlərin keyfiyyətini, istiqamətini, yönümünü, hədəfini insanların öz öhdəsinə buraxan kimi oldu (?!). Guya bu böyüklükdə bəşəri dəyişikliklərə rəvac verən Elçi (s), insanları «necə alınar, alınar» kimi varianta düçar etmişdir. Guya ümmətin variantlar xaosu və eksperimentlər bazası kimi bir vəziyyətə düşməsinə razı olmuşdu. Çox qəribə yanaşma tərzidir, deyilmi? Əlbəttə ki, Peyğəmbərimizin (s) tam kamil, dəqiq və birmənalı tövsiyələri, həyatın hər bir çalarına aid

məsləhət və buyuruşları bu yanaşma tərəfdarlarının mövqelərində daşı daş üstə .qoymur

**Peyğəmbərimizin (s) vəsiyyəti**

İslam Peyğəmbəri (s) böyük bir İlahi missiya ilə gəlir. Son dərəcə çətin və məşəqqətli Məkkə dövrünü yaşayır. Sonra Mədinədə İslamın təşəkkül tapması, müsəlmanların icmalaşması prosesləri yaşanır. Böyük çətinliklərlə düşmənlərin çoxsaylı mütəşəkkil hücumları qarşısında gənc İslam icması duruş gətirir. Olmazın məşəqqətlər hesabına ümmət formalaşır və yaşaya bilən, inkişafa qadir bir duruma gəlir. Ən nəhayət, Rəsuli-Əkrəm (s) ümmətə son çatdırışlarını edir. Bu çatdırışlar Təbuk yürüşündən, Qədir-Xum vəsiyyətlərindən tutmuş, «cümə axşamı müsibəti» adlanan son günlərədək bir silsiləvi və tamamilə aydın forma ilə səciyyələnirdi. Yalnız bundan sonra, yüz minlərlə müsəlmana hüccətin tamam olmasından, məlumatın tam həcmdə verilməsindən .sonra Həzrət Rəsuli-Əkrəm (s) haqq dünyasına köçür

İndi bir balaca məlumatı olan insan da təsdiq edər ki, Peyğəmbərimiz (s) ümmətin gələcəyi barədə birmənalı və dəqiq tapşırıqlarını verib. Və hətta zərrədək məlumatı olmayan, sadə bir məntiqə malik olan insan da inanarmı ki, bu cür çətinliklər hesabına ərsəyə gələn, ٢٣ il gecəli-gündüzlü olmazın zəhmət və məşəqqətlər hesabına yaranan ümməti əziz Peyğəmbərimiz (s) heç bir tövsiyə və tapşırıq vermədən özbaşına buraxır və ümməti səhvdən-xətadan xali olmayan insanların eksperiment poliqonuna çevrilməsinə razı olur?! Hansı məntiqli və düşünən insan şeylərin belə absurd ...vəziyyətdə olmasını təsdiq edər?! Təbii ki, yalnız qərəzli kəs

Qeyd etdik ki, həm o zamanda, həm də indi bu mövzular böyük əhəmiyyət kəsb edir. Ən azı ona görə ki, ümmətin getməli olduğü və getdiyi istiqamətin uyğunluğunu yoxlamaq baxımından məhz bu mövzuda hansı yanaşmanın rəhbər tutulması həlledici .təsirə malikdir

Peyğəmbərimizin (s) rehləti bir işıq salır bu hadisələrə. Müsəlmanların tutduğu yol, sonrakı pərakəndəliklər, vəhdətin pozulması, müsəlmanların İslamın dəyərlərindən uzaq düşməsi, müsəlman kimliyinin son dərəcədə zəif hala gəlməsi – bütün bunların kökü Rəsuli-Əkrəmin (s) rehləti ətrafındakı dövrlərdə baş verən hadisələrlə bu və ya .digər dərəcədə bağlıdır

Tədqiqatlar bəlli edir ki, Peyğəmbərimiz (s) müxtəlif dönəmlərdə, müxtəlif şəraitlərdə ümmətin yolunu itirə bilməsi haqqında narahatlıqlarını büruzə verirdi. Müxtəlif forma və üslublarla müsəlmanların diqqətini bu məsələyə cəlb edir. Rehlətindən ١ ay öncə Həzrət (s) buyurur: «Ayrılıq yaxın olmuşdur və qayıdış Allaha doğrudur. Çağrılmağım və Haqqın dəvətini qəbul etməyim, cavablandırmağım yaxındır. Və mən ٢ qiymətli şeyi sizin aranızda qoyub gedirəm: Allahın Kitabını və Əhli-beytimi. Və lətif və agah olan Allah Təala mənə xəbər verdi ki, bu ikisi heç zaman bir-birindən ayrılmaz ta ona qədər ki, Kövsər hovuzunun kənarında mənə qovuşacaq. Bəs yaxşı düşününüz, bu ikisi ilə .«necə rəftar edəcəksiniz

Diqqət edək. Peyğəmbərimizin (s) rehləti yaxınlaşdıqca, Həzrət (s) müsəlmanları özündən sonrakı vəziyyətə uyğun hazırlaşdırır. Nə etməlilərilə bağlı, nəyə istinad etməliləri ilə, nəyə söykənəcəkləri ilə, nəyi özləri üçün rəhbər seçəcəkləri ilə bağlı müsəlmanları

tam məlumatlandırır və heç bir şəkk-şübhə üçün, azma və sapma üçün yer qoymur. Onlara bir düstur verir ki, buna riayət etdikləri təqdirdə sapmaları və çaşmaları mümkünsüz olacaq. İki fundamental əsası göstərir müsəlmanlara. Peyğəmbərimiz (s) bəlli edir ki, Qiyamət gününə qədər, Kövsər hovuzunun başında onun mübarək vücuduna qovuşancaya qədər bu ٢ misilsiz dəyərə malik olanlar bir-birindən ayrılmayacaq. Həm Quran, həm Əhli-beyt (ə) sona qədər birlikdə, ayrılmadan qalacaq. Öz dəyişməzliyində, saflığında, doğru yol göstərməyində, paklığında, insanları hidayət ediciliyində bu ٢ qiymətli dəyər sabit qalacaq və Peyğəmbərə (s) qovuşanadək bunların mahiyyəti, bunların insanlar üçün hidayətediciliyi cəm halda və harmonik .surətdə mövcud olacaq

**Bütün müsəlmanlara verilən əmanət**

Bu dəyərləri Həzrət Peyğmbər (s) müsəlman üçün ən yüksək statusa qaldırır - əmanət adlandıır. Avtomatik olaraq, bunun qorunub-saxlanması ilə bağlı ümmətin üzərinə vəzifə gəlir. Qorumaq nə deməkdir? Buyuruşlarla tanış olub, onlara əməl etməkdir. Əhli-beyti (ə) tanıyıb, əməllərini anlayıb, həyat prinsiplərini dərk edib, bunlara uyğun .yaşamaq, onların ardıcılı olmaqdır

Tarix göstərir ki, Peyğəmbərimiz (s) axıradək fitnə düşməsinin qarşısını bütün qüvvəsi ilə almağa çalışırdı. Rehlətindən bir neçə gün öncə, Həzrət (s) Mədinə məscidində sübh namazından sonra müsəlmanlara müraciətlə demişdi: «Ey camaat! Fitnə atəşləri şölələnib və fitnələr qaranlıq gecənin dalğalarının hissələri kimi baş qaldırmışlar. Mən Qiyamət günü sizi qarşılayacağam. Və siz Kövsər hövuzunda mənə tərəf gələcəksiniz. Agah olunuz ki, Səqəleyn (٢ qiymətli

əmanət) haqqında sizdən soruşacağam. Bəs baxınız, məndən sonra o ikisi haqqında rəftarınız necə olacaq. Çünki Lətif və Xəbir Allah məni agah edib ki, bu ikisi bir-birindən ayrılmayacaq – o zamana qədər ki, mənimlə görüşəcəklər. Agah olunuz ki, mən bu ikisini sizin aranızda qoyub gedirəm. Onlardan irəli çıxmayınız ki, bir-birinizdən ayrılmış .«və dağınq olarsınız. Onlarla münasibətinizi əsirgəməyiniz ki, həlakətə çatarsınız

Bir daha görürük ki, ٢ fundamental, qiymətli əmanətin - Qurani-Kərimin və Əhli-beytin (ə) birgə qorunması barədə tövsiyə verir Peyğəmbərimiz (s) müsəlmanlara. Bunlardan yapışarsa, ayrılmazsa - nicata yetişər ümmət. Heç zaman müşkülü, çətinliyi olmaz onları əmələn qorusa. Amma onlardan irəli keçmək istəyərsə, onları adlayıb keçərsə - pərakəndə olacaq, ayrılacaq, bölünəcək. Yaxud, onlara münasibətdə soyuqluğa, biganəliyə yol verərsə - Peyğəmbərimizin (s) xəbərdarlığına görə, ümmət həlakətə .düşər

### Aşuranın Bəni–Səqifə kökləri

Ümmətin bugünkü zillətli durumu əslində bu ٢ əmanətə sayğısızlığın təzahürləridir. Həzrət Peyğəmbərdən (s) sonra ümmət bu bir-birindən ayrılmaz əmanətlərlə necə rəftar etdisə, buna uyğun nəticələr də əldə etdi. Sonadək Peyğəmbəri (s) ən çox narahat edən məsələ - ümmətin sonrakı durumu idi, Quranın və Əhi-beytin (ə) .ayrılmazlığını ümmət tərəfindən yaşadılması ilə bağlı nigarançılığı idi

Çox təəssüflər olsun ki, əziz İslam Peyğəmbərinin (s) vəfatı ilə, həmin o fitnələr yaşanmağa başlandı. Bəni-Səqifə müsibəti baş verir. Həmin o müsəlmanlar ki, ,Peyğəmbərin (s) mübarək vücudunun nurundan bəhrələnirdilər

vəfatından sonra, Həzrətin (s) olmamazlığı şəraitində ilkin imtahanlarını lazımınca verə bilmirlər. Müsəlmanlar – az bir istisna nəzərə alınmasa – bu ilkin imtahanlarından elə .mənfi qiymət alırlar ki, əsrlər boyu bütün ümmət bunun altını çəkir

İllər keçəcək, onillər sonra məhz bu mənfi qiymətlə verilən imtahana görə Aşura vaqiəsi yaşanacaq, Kərbəlada bəşəri müsibət baş verəcək. Aşuranın köklərindən biri - bəni-Səqifədə tayfakeşliyin, qohumbazlığın yenidən baş qaldımasından qidalanır. Kiminsə öz «xidmətlərindən» qürrələnməsi, kiminsə öz «mənəm»liyini qabartması, nəfslərin ortağılığa çıxması nəticəsində ümmət Peyğəmbərimizin (s) vaxtında yetişdiyi yüksək səviyyədən Aşura dönəmindəki zillət və aşağılanmayadək endi. Artıq ümmətin başı nəinki tək özünə qarışmış olacaq, böyük bir münafiq qrupu əmələ gələcək və bu qrup o qədər azğınlaşacaq ki, hətta Əhli-Beytə (ə) əl uzadacaq, ümmətin İmamını (ə) ...şəhid edəcək

**İmamətin səkkizinci nuru**

Səfər ayının sonuncu günündə şəhid olan ٨-ci İmam Həzrət Rzanın (ə) da mübarək həyatı bu baxımdan istisna təşkil etmədi. Və o Həzrətin (ə) həyatının, imamətinin tarixinin öyrənilməsi ümumilikdə imamətin daşıyıcılarına olan münasibət barədə dolğun təsəvvür yaradır. Bu müqəddəs əmanətə qarşı törədilən zülmlər, o cümlədən, haqqı bilə-bilə, insanların nahaqq və batilə dəstək verməsi - əfsus olsun ki, ümmətin imamətə nisbətdə tutduğu tənəzzül mövqeyinin ən bariz göstəricilərindəndir. İnsanlar bildikləri, dərk etdikləri, zəmanə İmamını (ə) tanıdıqları halda, öz imtahanlarını (layiqincə verə bilmədilər, İmamlarını (ə

.zalım müstəbidlərin, qəsbkar və diktatorların şərindən qoruya bilmədilər

İmam Rza (ə) hicri-qəməri təqvimi ilə ۱۴۸-ci ildə, zilqədə ayının ۱۱-də Mədinə şəhərində dünyaya gəlmişdir. ۵۵ il ömür sürən İmam (ə), bunun ۲۱ ilini imamət nurunun daşıyıcısı olur. Müqəddəs ata-babasının irsinə sahib olan İmam Rza (ə), öz mübarək imaməti dövründə vəziyyətə uyğun öz böyük missiyasını bəşəriyyətə çatdırmış, insanları .Həzrət Peyğəmbərin (s) gətirdiyi İlahi təlimin həqiqətləri ilə tanış etmişdir

İmam Rzanın (ə) atası ۷-ci imam Həzrət Museyi-Kazım (ə), anası həzrət Nəcmiyyədir (s.ə). Azərbaycan insanına xüsusi lütf inayət olunub onunla bağlı ki, İmam Rzanın (ə) ۲ bacısının – Həzrət Həkimənin (Bibi-Heybətdə) və Həzrət Rəhimənin (Nardaranda) müqəddəs hərəmləri bizim torpaqdadır. Və bu lütf müqabilində, imamət əmanətlərinin, bu müqəddəs imamzadə hərəmlərinin ziyarəti baxımından buradakı .müsəlmanların məxsusi məsuliyyətləri də vardır

Şəhadətindən öncəki gecə İmam Rza (ə) cəddi Həzrət Peyğəmbəri (s) yuxuda görür. .«...Həzrət (s) əziz övladına buyurur: «Sabah bizim yanımıza gəl

Məlum olduğu kimi, zalım Abbasi xəlifəsi Məmunun (ə) əmri ilə İmam Rzanı (ə) zəhərləyirlər. Həzrət (ə) zəhərləndikdən sonra evə qayıdır... Yaxınlarına tapşırıq verir: «Evin xalçalarını yığışdırın və heç kimi evə gəlməyə qoymayın... Mənim can verən .«...zamanımdır. Mən də babam Hüseyn (ə) kimi torpaq üstündə can vermək istəyirəm

Axır anlarında da İmam (ə) Aşura mesajını göndərir onu sevənlərə. İmam Hüseyn (ə) məktəbini unutmamaq göndərişi, əmanətə sədaqət dəvəti var burada. Allah Təala

## Haqqında mərkəzi

Allahın adı ilə

Rəhman və Rəhimli olan Allahın adı ilə.Və bütün həmdlər aləmlərin rəbbi olan Allaha .məxsusdur

.Varlıq aləminin Kövsəri olan Həzrəti Fatiməyi Zəhraya (a) təqdim olunur

(Bilən kimsələrlə (alimlər) bilməyənlər (cahillər) eynidirlərmi? (Zümər surəsi, ayə ۹

:Ön söz

İsfahan Qaimiyyə kompüter araşdırmalar müəssisəsi ۲۰۰۶-cı ildən Mərhum Ayətullah Seyyid Həsən Fəqih İmaminin nəzarəti altında,elmi mərkəzlərdə tanınan görkəmli tələbələrin vasitəsi ilə məzhəb,mədəniyyət və elmi sahələrdə öz fəaliyyətinə .başlamışdır

:Məramnamə

İsfahan Qaimiyyə kompüter araşdırmalar müəssisəsi təhqiqatçıların dini biliklərə rahət və tez bir zamanda yiyələnmələri üçün hər bir xidməti onların ixtiyarında qərar vermişdir.Və bu sahədə təəssübkeşlikdən,ictimai,siyasi,fərdi cəryanlardan uzaq duraraq yalnız və yalnız elmi sahədə ixlasla öz xidmətini həyata keçirməkdədir.Bu səbəbdən adı çəkilən müəssisə layihəsini həyata keçirmiş.Və tədqiqat üçün nəzərdə tutulmuş kitabları,məqalələri mütəxəssislər və müxtəlif təbəqələrdən olan insanlar üçün,bir neçə dillərdə və formalarda hazırlayaraq,heç bir məbləğ tələb etmədən sosial .medyada istifadəçilərin ixtiyarında qoymuşdur

:Hədəflər

Quran və Əhli beyt mədəniyyətini və maarifini yaymaq.۱

İnsanları,xüsusən gəncləri tam dəqiq şəkildə dini məsələləri araşdırmağa.۲ sövqləndirmək

Telefon,tablet və kompüterlərdə olan faydasız,yararsız mövzuların yerini .۳ faydalı,mənəviyyatlı mövzularla doldurmaq

.Təhqiqatla məşğul olan tələbələrə xidmət etmək.۴

.Kitab və elmi əsərlər oxumaq mədəniyyətini yaymaq.۵

.Müəlliflərin öz elmi əsərlərini digital formada yaymaq üçün onlara şərait yaratmaq.۶

:İcraçılıq

.Qanunla icazəli olan lisenziyaya malik əsərlərin yayımı.۱

.Bu mərkəz kimi xidmət göstərən oxşar mərkəzlərlə əlaqə.٢

.(Paralel xidmətlərdən çəkinmək (başqalarının etdiklərini təkrarlamamaq.٣

.Yalnız və yalnız elmi məsələləri yaymaq.۴

.Nəşriyyatın mənbələrini qeyd etmək.۵

.Qeyd:Kitabda olanlara görə məsüliyyət o kitabı yazan müəllifin öhdəsindədir

:Müəssisənin fəaliyyəti

.Kitabların çapı və nəşri.١

.Kitab oxumaq müsabiqələrinin təşkili.٢

.Məcazi sərgilərin istehsalı.٣

.Kompüter oyunlarının istehsalı.۴

Qaimiyyə internet saytının yaradılması:www.ghaemiyeh.com.۵

.Sərgi məhsullarının və moizələrin istehsalı.۶

.Şər'i,əxlaqi və etiqadi suallara cavab.٧

.Mühasibat,mətbuat yaratmaq və sms... sistemlərinin layihəsi.٨

.Təlim kurslarının həyata keçirilməsi.٩

Tərbiyəçi şəxslər hazırlamaq üçün təlim kurslarının təşkili.١٠

Kompüterdə,tabletdə və telefonlarda icrası mümkün olan minlərlə proqramların.١١ dünyada məşhur olan səkkiz formada istehsalı

JAVA.١

ANDROID.٢

EPUB.٣

CHM.۴

PDF.۵

HTML.۶

CHM.٧

GHB.٨

.٧.Qaimiyyə kitab bazarı adına dörd market

ANDROID.١

IOS.٢

WINDOWS PHONE.٣

WINDOWS.۴

deyilənlər müəssisənin veb saytında Fars,Ərəb,İngilis və Azərbaycan dillərində pulsuz

.istifadəyə verilmişdir

:Sonunda

Mərcəi təqlid müctəhidlərin dəftərxanalarından (ofis),müəssisələrdən,nəşriyyatçılardan,müəlliflərdən və əməyi olan bütün şəxsiyyətlərdən bizlərə hədəfə çatmaqdan ötrü yardım etdikləri üçün səmimi qəlbdən .təşəkkür edirik

:Mərkəzin ünvanı

İsfahan-Əbdurrəzzaq küçəsi-Hacı Muhəmməd Cəfər adına bazar-Şəhid Muhəmməd Həsən Təvəkküli küçəsi-blok١٢٩/٣۴-birinci mərtəbə

veb sayt:www.ghbook.ir

mail:Info@ghbook.ir

mərkəzin ofis telefonu: ٠٠٩٨٣١٣۴۴٩٠١٢۵

Tehran ofisi: ٠٠٩٨٢١٨٨٣١٨٧٢٢

Biznes və alqı satqı: ٠٠٩٨٩١٣٢٠٠٠١٠٩

Mərkəzdə çalışan insanlarla əlaqə yaratmaq üçün nəzərdə tutulan nömrə: ٠٠٩٨٩١٣٢٠٠٠١٠٩

